DOI: https://doi.org/10.36719/2706-6185/01/4-7

**Şikar Məhəmmədəli oğlu Qasımov**
Azərbaycan Texniki Universiteti
tarix elmlər doktoru
shikarqasimov@mail.ru
**Flora Bayram qızı Qasımova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
flora.qasimova@mail.ru

# AZƏRBAYCAN MƏDƏNİYYƏTİ MÜSTƏQİLLİK İLLƏRİNDƏ

**Xülasə**

Müstəqilliyimizin ilk illərində bir çox sahələrdə olduğu kimi, mədəniyyət sahəsində də siyasi dairələrin siyasi səhvləri, idarəçilik bacarığının olmaması ucbatından inkişaf olmayıb. Amma ümummilli lider Heydər Əliyevin hakimiyyətə gəlişi ilə bütün sahələrdə olduğu kimi, mədəniyyətdə də dönüş yarandı. O, mühüm strateji sahələrə (milli dil, teatr, kino, təhsil və s.) dair bir sıra uğurlu sərəncamlar imzalayıb. Heydər Əliyevin təhsilə, mədəniyyətə verdiyi dəyər və diqqət nəticəsində ölkəmiz milli teatrda, milli kinoda, təhsil sistemində saysız-hesabsız uğurlara imza atmışdır.

***Açar sözlər:*** *Azərbaycan Respublikası, Heydər Əliyev, ana dili, Azərbaycan mədəniyyəti, milli teatr, milli kino*

**Shikar Mahammadali Gasimov**
Azerbaijan Technical University
doctor of historical sciences
shikarqasimov@mail.ru
**Flora Bayram Gasimova**
Azerbaijan State Pedagogical University
flora.qasimova@mail.ru

## Azerbaijan culture in the years of independence

**Abstract**

İn the early years of our independence, as in many areas, there was no development in the field of culture due to political mistakes of political circles and lack of managerial skills. But with the coming of national leader Heydar Aliyev to power, there has been a breakthrough in culture as in all areas. He has signed a number of successful decrees on important strategic areas (national language, theatre, cinema, education, etc.). As a result of the value and attention given by Haydar Aliyev to education and culture, our country has achieved countless successes in national theatre, national cinema and education systems.

***Keywords:*** *Republic of Azerbaijan, Haydar Aliyev, native language, Azerbaijani culture, national theatre, national cinema*

## Giriş

Azərbaycan Respublikası müstəqillik əldə etdikdən sonra mədəniyyətin inkişafı sahəsində də yeniləşmə prosesi daha da genişləndi. Yaradıcı ziyalıların və ittifaqların fəaliyyətinə dövlət qayğısı gücləndi. 1997-ci il noyabrın 10-da Azərbaycan Respublikasının prezidenti «Azərbaycan Respublikasında ədəbiyyat ve incəsənət xadimlərinə dövlət qayğısının artırılması haqqında» fərman imzaladı. Qocaman ədəbiyyat xadimləri, gənc istedadlı yazıçı va şairlər üçün fərdi təqaüdlər təyin edildi. 1998-ci il may ayının 22-də «Azərbaycan Respublikasında fəxri adlar haqqında». 2002-ci il iyun ayının 11-də «Azərbaycan Respublikası prezidentinin fərdi təqaüdlərinin təsis edilməsi haqqında» fərmanlar verildi. 2002-ci ilin iyun ayında elm, mədəniyyət, incəsənət, maarif və digər

sahələrdə böyük xidmətləri olmuş, 150 nəfərə prezident təqaüdü təyin edildi. Bu proses sonrakı illərdə də davam etdirilir (Əliyev, 1997).

Möhtərəm Heydər Əliyevin hakimiyyətə gəlişi ilə elm, təhsil, mədəniyyət tədricən dirçəlməyə başladı. Hələ sovetler dövründə Heydər Əliyevin respublikada yaratdığı güclü təhsil sistemi, kadr polensialı yaratmağa imkan vermişdi. Hakimiyyətdə olduğu bütün dövrlərdə cənab Heydər Əliyev təhsilə xüsusi qayğı göstərmişdi. Yeni tipli məktəblər tikilmiş, kitablarla təmin edilmiş və maddi-texniki baza möhkəmləndirilmişdir (Qasımov, 1996).

Çox əfsuslar olsun ki, müstəqilliyimizin ilk illərində rəhbərliyimizin naşılığı ucbatından təhsilimizə elə bir güclü zərbə vuruldu ki, bir neçə il biz bu təsirdən yaxa qurtara bilmədik. Yenə də cənab Heydər Əliyev təhsilimizi dağılmaq təhlükəsindən xilas etdi. Müəllimlərin öz peşəsinə həvəsini artırdı (Abdullazadə, 1998).

Möhtərəm Heydər Əliyev 2000-ci il iyunun 13-də «Azərbaycan Respublikasında Təhsil sisteminin təkmilləşdirilməsi haqqında» imzaladığı fərman Azərbaycanda təhsilin, elmin və bütövlükdə mədəniyyətin inkişafını təmin edən sənəddir. Azərbaycan təhsili tədricən dünyəvi və humanist məzmun kəsb edərək milli irsə, beynəlxalq standartlara, qabaqcıl ölkələrin təcrübəsinə istinad edərək inkişaf edir.

Azərbaycanda hakimiyyətə gəldiyi gündən Heydər Əliyev dövlət dilinin yeni inkişaf dönəmində yaranmış vəziyyəti nəzərə alaraq 2001-ci il iyun ayının 18-də «Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında» və latın qrafikasına keçidlə bağlı verdiyi fərmanda, dövlət dili haqqında, 2003-cü il Azərbaycan Respublikasının qanununda dilimizin inkişafına verilən təminat öz əksini tapmışdır. 18 iyun tarixli sənəddə dilimizin tarixi inkişafı boyu əldə etdiyi uğurlarla yanaşı, yaşadığımız dövrdə dövlət dili sayəsində yaranmış problemlər də geniş təhlil edilmiş və həmin problemlərin həlli yolları göstərilmişdir. Fərmanda deyilir: «Azərbaycan Respublikasının on illik inkişaf yolunun təcrübəsi göstərir ki, digər sahələrdə olduğu kimi ana dilimizin öyrənilməsi və tətbiqi sahəsində də hələ görüləsi işlər çoxdur» (Mirzəyev, 2000). Bu tarixi sənəddə görüləsi işlər konkret olaraq göstərilir və qarşıda duran vəzifələr açıqlanır. Həmin fərmanda birinci olaraq ana dilinin tədrisi işi xüsusi qeyd edilərək göstərilir: «Ölkəmizin orta və ali məktəblərində Azərbaycan dilinin müasir dünya standartlarına, milli-mədəni inkişaf tariximizin tələblərinə cavab verən tədris işinin təkmilləşdirilməsinə ehtiyac vardır». Fərman ümummilli lider Heydər Əliyevin 1969-cu ildən – Azərbaycana rəhbərlik etdiyi vaxtdan başlayaraq milli dillə əlaqədar həyata keçirdiyi böyük tədbirlərin qanunauyğun davamıdır (Qafarov, 1998).

Heydər Əliyevin dövründə Cənubi Azərbaycan sözü üzərindən yasaq götürüldü. Əslən cənubdan olan şairlərlə sıx ünsiyyət saxlanıldı. Bütün bunlar Heydər Əliyevin ziyalılara olan qayğısının nəticəsi idi. Bu qayğının davamı olaraq Heydər Əliyev son on ildə pedoqoji işçilərin əmək haqqının artırılması haqqında on dəfə sərəncam imzalamış, xüsusi xidmətləri, əməyi olan müəllimlər mükafat və fəxri təqaüdə layiq görülmüşlər ki, bu da müəllimlərə işlərində böyük ruh yüksəkliyi yaratmışdır (Abdullayev, 2000).

«Mən həyatımın qalan hissəsini də xalqıma bəxş edəcəyəm» kəlamının sahibi öz sözünün üstündə durdu. Son nəfəsinə qədər xalqını düşündü, onun uğrunda ömrünü şam kimi əritdi və polad iradə sahibi olduğunu bütün bəşəriyyətə nümayiş etdirdi. Özü isə müstəqil Azərbaycanın simvoluna çevrildi. Mükafatı xalqın qəlbində əbədi məskən salaraq, əsl insanlıq mücəssiməsi olan heykələ döndü.

Ulu öndər Heydər Əliyevin böyüklüyü onda oldu ki, o, itmiş inamı xalqa qaytara bildi. Bu yolda gördüyü hər bir işdə xalqa arxalandığını dönə-dönə bildirirdi. Çıxışlarının birində demişdir:
«Mənim yaratdığım hər bir şey mənim üçün əzizdir. Zavod da, fabrik də, elektrik stansiyaları da, yol da, körpü də, ev də, bina da, saray da - hər bir şey. Amma mənim üçün hər şeydən əziz mənim xalqımdır, mənim vətənimdir, mənim torpağımdır (Əhmədov, 1997).

Qədirbilən xalqımız bütün bunları unutmur və unutmayacaq. Bu gün biz onun yoxluğuna inanmırıq. Əslində o, bizimlədir. Çünki o, mükəmməl bir hüquqi dövlət yaradıb bizə vermişdir. Elə bir dövlət ki, daha heç kim onu sarsıda bilməz.

Deyirlər ən böyük təsəlli dünyasını dəyişənin qoyub getdiyi əməllərə baxıb fəxr etməkdir. Azərbaycan xalqının ən böyük təsəllisi isə cənab İlham Əliyevin ölkə prezidenti seçilməsidir.

Deməli, xalqın dahi oğlunun əməlləri yaşayır, arzuları həyata keçir. Xalq buna inanır. Azərbaycanın bugünkü inkişaf dinamikası, quruculuq işləri və xalqın sosial-rifah halının günü-gündən yaxşılaşması ümummilli lider Heydər Əliyevin qurduğu müstəqil Azərbaycan dövlətinin inkişafını göstərir (Həsənov, 2005).

Mədəni həyatımızın və ədəbi-ictimai fikrimizin inkişafındakı müstəsna yerini, milli özünüdərkin bərqərar olmasında böyük rolunu nəzərə alan ölkə prezidenti cənab İlham Əliyev 23 yanvar 2006-cı il "Molla Nəsrəddin" jurnalının 100 illik yubileyi haqqında sərəncam imzaladı. Ölkə başçısı həmin sərəncamda "Molla Nəsrəddin" jurnalı ilə bərabər, XX əsrin əvvəllərində Azərbaycan mədəniyyətinin inkişafına töhfələr vermiş digər maarifçi mətbuat orqanlarına da həsr olunmuş tədbirlərin hazırlanmasını vacib saymışdır (Böyük ipək yolu: dünəni, bu günü, sabahı, 1998).

Ölkədə Bakı Bələdiyyə teatrı, Tənqid-Təbliğ teatrı, Milli Dastan teatrı, Dövlət Gənclər teatrı, Yuğ teatrı, Bakı Kamera teatrı, Pantomim teatrı kimi sənət ocaqları təşkil olundu. 2000-ci ildə artıq respublikada 26 dövlət teatrı fəaliyyət göstərirdi. Opera və Balet teatrında 1997-ci ildə Ü.Hacıbəyovun «Koroğlu» operası, «Arşın mal alan» musiqili komediyası, Milli Dram Teatrında S.Vurğunun «Fərhad və Şirin» pyesi, 1998-ci ildə Musiqili Komediya teatrında «O olmasın, bu olsun» musiqili komediyası tamaşaya qoyuldu. 1996-cı ildə S.Əsgərovun «Solğun çiçəklər» operası tamaşaya qoyuldu. Bəstəkar C.Hacıyevin dövrün dramatizmini, xalqın ümidini, inamını, sədaqətini musiqi dili ilə əks etdirən «Onu zaman seçib» adlı VIII simfoniyası, bəstəkar Sərdar Sərdarovun «Böyük vətəndaş» haqqında odası xalqımın səadəti, tərəqqisi və müstəqilliyi uğrunda daim mübarizədə olan prezident Heydər Əliyevə həsr olunmuşdur. Bəstəkar Vasif Adıgözəlovun 1997-ci ildə yazdığı «Qarabağ» oratoriyası Qarabağ fəryadını özündə əks etdirirdi (İsmayılov, 1999).

Respublikada iqtisadi çətinliyin olmasına baxmayaraq, Azərbaycan kinosunu böhrandan çıxarmaq üçün yollar axtarıldı. «Azərbaycanfilm» kino-studiyası 1994-cü ildən etibarən yenidən dövlət büdcəsindən maliyyələşdirməyə başlandı. Ölkədə istehsal edilən filmlərin toplanması, bərpası və səmərəli istifadə olunması üçün dövlət kino fondu təşkil edildi (Azərbaycan Respublikası 1991-2001, 2001).

Azərbaycan kinomatoqrafçıları «Əhli-kef», «Fransız», «Hər şey yaxşı olacaq» (rejissor V.Mustafayev), «Yarasa» (rejissor A.Salayev), «Həm ziyarət, həm ticarət», «Yerlə göy arasında» (rejissor R.Ocaqov), «Uçurulmuş körpü», «Özgə vaxtı» (rejissor H.Mehdiyev), «Bəxt üzüyü» (rejissor R.Əzizbəyli) kimi yüksək bədii dəyərli fılmlər yaratmışdılar. Qarabağ müharibəsinə həsr edilmiş kinolar da meydana gəlmişdir. «Ağ atlı oğlan» (rejissor Ə.Əbluc), «Fəryad» (rejissor C.Mirzəyev) kimi kinolentlərdə Qarabağ müharibəsi ilə bağlı epizodlar kinoya gətirilmişdir (Həsənov, 1997).

Ümummilli lider Heydər Əliyevin ömür yolundan bəhs edən «General», «Birinci», «Moskva-Kreml», «Lider», «Tale», «Əsil məhəbbət haqqında», «Bir həsədin tarixi» (rejissor V.Mustafayəv) sənədli fılmləri Azərbaycan kinosu tarixində bütöv bir salnamədir. Müstəqil Azərbaycan kinosu dünya ekranlarına yol açmışdır. «Yarasa» bədii filmi 1996-cı ildə Fransada keçirilən kinofestivalda «Avropanın tammetrajlı ən yaxşı bədii filmi» adına, Misir Beynəlxalq kinofestivalında ən yüksək mükafata layiq görüldü. «Özgə vaxtı» filmi 1997-ci ildə Madrid Beynəlxalq kinofestivalında yüksək qiymətləndirildi. 1997-ci ildə «Cavan qadın üçün kişi» (rejissor M.İbrahimbəyov) fılmi Kolumbiyanın paytaxtı Boqotoda bürünc mükafata layiq görülmüşdü. 2001-ci ildə Moskva Avroasiya teleforumunda «Əsil məhəbbət haqqında» sənədli fılmi üç mükafata 2002-ci ildə «Bir həsədin tarixi» filmi «Qran-Pri» mükafatına layiq görüldü (Azərbaycan-Türkiyə münasibətləri, 1997).

Teleradio məkanındakı yeniliklər də ölkəmizin son illərdə əldə etdiyi böyük uğurların daha bir ünvanı kimi dəyərləndirilə bilər. Bu sahədəki uğurların miqyasını təsəvvürə gətirmək üçün təkcə onu xatırlamaq lazımdır ki, yaxın keçmişə qədər cəmisi bir televiziya və bir radiosu olan Azərbaycanda bu gün 11 radio, ümumrespublika yayımçısı olan 9 televiziya və 14 regional televiziya kanalı fəaliyyət göstərir. Göründüyü kimi, Azərbaycanın efir məkanında kifayət qədər rəngarənglik mövcuddur. Bir sözlə efirimizin hüdudları kimi onun imkanları da olduqca genişdir. Bütün bunlar müstəqillik illərində ölkəmizdə Azərbaycan mədəniyyətinin inkişafı sahəsində əldə olunmuş çox ciddi uğurların göstəricisidir (Şahbazov, 1997).

## Nəticə

Bütün bu nailiyyətlər eyni zamanda onu da sübut edir ki, XX əsrin 20-40-ci illərində Azərbaycan mədəniyyətinin inkişafı sahəsində əldə edilmiş nailiyyətlər müstəqillik dövründə özünün yeni, daha yüksək mərhələsinə çatmışdır. Müstəqillik yaradıcı insanların fəaliyyəti və hərtərəfli inkişafı üçün geniş imkanlar açmışdır.

## Ədəbiyyat

1. Əliyev, H. (1997). Müstəqilliyimiz əbədidir. Bakı.
2. Qasımov, M. (1996). Azərbaycan beynəlxalq münasibətlər sistemində (1991-1995) Bakı.
3. Abdullazadə, F. (1998). Heydər Əliyev. Siyasi portret. Bakı.
4. Mirzəyev, R. (2000). «Əsrin müqaviləsi»ndən başlanan yol. Bakı.
5. Qafarov, T. (1998). Azərbaycan tarixi. (XX əsrin 80-90-cı illəri). Bakı.
6. Abdullayev, V. (2000). Azərbaycan yeni diplomatiya məkanında. Bakı.
7. Əhmədov, M. (1997). Azərbaycan: yeni neft erası və beynəlxalq siyasət. Bakı.
8. Həsənov, Ə. (2005). Müasir beynəlxalq münasibətlər və Azərbaycanın xarici siyasəti. Bakı.
9. Böyük ipək yolu: dünəni, bu günü, sabahı. (1998). Bakı.
10. İsmayılov, M. (1999). Qarabağın tarixi. Bakı.
11. Azərbaycan Respublikası 1991-2001. Bakı, 2001.
12. Azərbaycan-Türkiyə münasibətləri. (1997). Bakı.
13. Şahbazov, E. (1997). Heydər Əliyev və Azərbaycan neftinin inkişafı. Bakı.
14. Həsənov, Ə. (1997). Azərbaycan və ATƏT: Ermənistan-Azərbaycan münaqişəsi və Dağlıq Qarabağ problemi ümumavropa təhlükəsizliyi fonunda. Bakı.

Göndərildi: 14.02.2019 Qəbul edildi: 29.05.2019

DOI: https://doi.org/10.36719/2706-6185/01/8-12

**Məmməd Allahverdi oğlu Hüseynov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti, Ağcabədi filialı
m.huseynov@mail.ru

# İKİNCİ DÜNYA MÜHARİBƏSİ İLLƏRİNDƏ AZƏRBAYCANLILARIN ALMAN FAŞİSTLƏRİNƏ QARŞI DÖYÜŞLƏRDƏ QƏHRƏMANLIQLARI

**Xülasə**

1941-1945-ci illər müharibəsində Azərbaycan əsgərləri alman faşizminə qarşı vuruşmuşlar. Onların arasında tank bölüyü komandiri Həzi Aslanov, cəsur atıcı İdris Vəliyev də var idi. İsrafil Məmmədov müharibədə iştirak etmiş soydaşlarımızdandır. Novqorod ətrafında gedən döyüşlərdə böyük qəhrəmanlıqlar göstərmişdir. Hərbi pilot leytenant Hüseynbala Əliyevi də bu siyahıya daxil etmək olardı. Azərbaycanlılar arxa cəbhədə də qəhrəmanlıq göstərdilər. Bundan əlavə, azərbaycan-lılar Bakını almaq planının baş tutmaması üçün öz doğma şəhərləri uğrunda böyük əzmlə mübarizə aparırdılar. Azərbaycanlılar partizan hərəkatında çox yaxşı idilər. Azərbaycanlı partizanlar Əhmədiyyə Cəbrayılov və Mehdi Hüseynzadə Avropa antifaşist partizan hərəkatında fəal iştirak ediblər.

***Açar sözlər:*** *faşizm, qəhrəmanlıq, Bakı nefti, Həzi Aslanov, İsrafil Məmmədov, Hüseynbala Əliyev, Mehdi Hüseynzadə, Əhmədiyyə Cəbrayılov, Akim Abbasov*

**Mahammad Allahverdi Huseynov**
Azerbaijan State Pedagogical University, Agjabadi branch
m.huseynov@mail.ru

## Azerbaijanian's heroism against german fascists in the year of the II World War

**Abstract**

In the war of 1941-1945, Azerbaijani soldiers fought against German fascism. Among them were Hazy Aslanov, the tank unit commander, and the brave shooter Idris Valiyev. Israfil Mammadov is one of our compatriots who fought in the war. He showed great heroism in the battles around Novgorod. Lieutenant Huseynbala Aliyev, a military pilot, could also be included to this list. Azerbaijanis also showed heroism in the rear. In addition, the Azerbaijanis fought with great persistence for their native city so that the plan to buy Baku would not be met. Azerbaijanis were very good in the guerrilla movement. Azerbaijani guerrillas Ahmadiyya Jabrayilov and Mehdi Huseynzadeh actively participated in the European antifascist guerrilla movement.

***Keywords:*** *fascism, heroism, Baku oil, Hazi Aslanov, Israfil Mammadov, Huseynbala Aliyev, Mehdi Huseynzadeh, Ahmadiyya Jabrayilov, Akim Abbasov*

## Giriş

Sovet döyüşçülərinin böyük fədakarlığına baxmayaraq, müharibənin ilk aylarında komandanlığın ciddi səhvləri üzündən baş vermiş geriləmələri rus zabitləri özlərinə haqq qazandırmaq üçün milli, xüsusən istehza ilə "yoldaş" adlandırdıqları türk xalqlarından olan əsgərlərin bacarıqsızlığının, qorxaqlığının nəticəsi kimi qələmə verməyə çalışırdılar. Lakin tarix bu iddiaların əsassız olduğunu sübut etdi.

Minlərlə azərbaycanlı oğlan və qız faşizmə qarşı əldə silah cəbhələrdə mərdliklə vuruşurdular. Müharibənin ilk günlərindən bir çox azərbaycanlı döyüşçü əsgəri rəşadətləri ilə fərqlənmişdi. Faşist işğalçılarının hücumundan bir aydan artıq müddətdə mərdliklə müdafiə olunan, düşmənə böyük təlafat verən Brest qalasının qəhrəman döyüşçüləri arasında 44 nəfər azərbaycanlı vardı. 1941-ci ilin oktyabr-dekabr aylarında Moskvaya yaxınlaşmış faşistlərlə döyüşlərdə əsgəri rəşadətinə görə tank bölməsinin komandiri Həzi Aslanov "Qırmızı Ulduz" ordeni ilə təltif edildi. Qvardiya baş

serjantı, plemyotçu İdris Vəliyev Borodino çölündə faşistlərlə döyüşdə təkbaşına 50-dən çox düşmən əsgərini məhv etdi. Kiçik leytenant İsrafil Məmmədov Novqorod yaxınlığında Pustmka kəndi uğrunda döyüşdə böyük qəhrəmanlıq göstərdi və Sovet İttifaqı Qəhrəmanı fəxri adına layiq görülmüş ilk azərbaycanlı oldu. Hərbi təyyarəçi leytenant Hüseynbala Əliyev Leninqrad göylərində düşmənin təyyarəsini vurub salmışdı. Son döyüşdə o, daha iki alman təyyarəsini məhv etmiş, 17 ağır yara almasına baxmayaraq, öz təyyarəsini sağ-salamat yerə endirə bilmişdi (Orucov, 1984).

Sovet ordusunun 1941-ci ilin axırlarında Moskva ətrafında böyük qələbəsi, Leninqradın qəhrəman müdafiəsi alman faşistlərinin "ildırımsürətli müharibə planı"nı pozdu. Hitler ordusunun məğlubedilməzliyi haqqında əfsanə puç oldu. 1942-ci ilin yanvarın 2-də ABŞ, Böyük Britaniya və SSRİ daxil olmaqla 26 dövlət faşist blokunu darmadağın etmək üçün öz hərbi və iqtisadi ehtiyyatlarını birləşdirmək haqqında bəyənnamə imzaladı, anti-faşist koalisiyası yarandı və getdikcə möhkəmləndi (İsmayılov, 1991).

Düşmən hələ güclü idi. Bu dəfə faşistlər alman-sovet cəbhəsinin cənub istiqamətində hücuma başladılar. Onlar 1942-ci il mayın əvvəllərində Kerçi, Sevastopolu, Xarkovu ələ keçirib Volqaya doğru irəlilədilər. "Edelveys" planına görə faşistlər Xarkovu tutduqdan sonra Qafqaza hücum edib zəngin neft, digər strateji xammal mənbələri, sənaye və kənd təsərrüfatı rayonunu ələ keçirmək, Bəsrə-İran-Xəzər yolu ilə müttəfiqlərin yardımından SSRİ-ni məhrum etmək, Yaxın va Orta Şərqin istilasına yol açmaq istəyirdilər. Bunun üçün general-feldmarşal Listin komandanlığı ilə "A" ordu qrupu yaradılmışdı. Onun I tank ordusu (komandanı general-polkovnik Kleyst idi) sentyabrın 6-da Qroznı-Mahaçqala-Bakı istiqamətində hücum edib sentyabrın 25-də Bakını tutmalı idi.

Faşist qoşunları iyulun 25-də Don çayını keçib cənuba doğru hücuma başladılar və avqustda Krasnodarı, Stavropolu Maykopu tutdular. Vəziyyət son dərəcə ağır idi. ABŞ və İngiltərə SSRİ ilə faşizmə qarşı bir koalisiyada olmalarına baxmayaraq, Cənubi Qafqazı, xüsusən Azərbaycanı ondan almaq istəyirdilər. Onların "Vilvet" planına görə Sovet ordusu Qafqazdan çıxarılıb Stalinqrad cəbhəsinə aparılmalı, burada isə almanlara qarşı 20 hərbi hava eskadrası və Böyük Britaniyanın 10-cu ordusundan ibarət amerikan-ingilis hərbi hissələri vuruşmalı idi.

Azərbaycan əhalisinin Sovet ordusu arxasından almanlarla əməkdaşlıq edəcəyindən ehtiyat edən SSRİ rəhbərliyi azarbaycanlıların Mərkəzi Asiya və Qazaxıstana köçürülməsi planını hazırlamışdı. Lakin respublika rəhbərliyi, xüsusən M.C.Bağırov Stalini inandıra bildi ki, azərbaycanlıların Azərbaycandan köçürülməsi nə iqtisadi, nə da siyasi baxımdan qələbəyə xidmət edə bilməz, bu, respublikada neft və pambıq kimi strateji məhsulların istehsalını azaldar, orduda vuruşan azərbaycanlı əsgərlərdə ruh düşkünlüyü yaradar. Sovet ordusunun cəbhələrdəki müvəffəqiyyətləri bu planların pozulmasında əhəmiyyətli rol oynadı.

Ali Baş Komandanlıq Zaqafqaziya respublikalarında, o cümlədən Azərbaycan SSR-da 1942-ci il sentyabrın 9-da hərbi vəziyyət elan etdi. Bakı müdafiə rayonu yaradıldı. Müdafiə-istehkam tikintisinə başlandı. Şəhər ətrafında səngərlər qazıldı, müdafiə xətləri uzaqvuran toplarla və tanklarla möhkəmləndirildi. Bakının müdafiəsi 10-cu atıcı briqadaya, hərbi-hava məktəbinə və Bakı dairəsi hava hücumundan müdafiə qoşunlarına tapşırıldı. Qırıcı təyyarəçilərin va zenitçilərin sayıqlığı sayəsində faşistlərin 1942-ci ildə 71, 1943-cü ildə isə 3 dəfə Bakı səmalarına soxulmaq cəhdi baş tutmadı. Düşmənin 96 təyyarəsi vurulub salındı. Samur çayı üzərindəki strateji əhəmiyyətli körpü də dəfələrlə edilən hava hücumlarından müvəffəqiyyətlə müdafiə edildi. Cənubi Qafqaz cəbhəsi döyüşçüləri arasında 66.1 min nəfər azərbaycanlı vardı. Azərbaycanlı döyüşçülərin cəbhələr boyu daha çox səpələnməsi ölkə rəhbərliyinin bu xalqa tam arxayın olmamasının təzahürü idi. Lakin Qafqaz döyüşlərində azərbaycanlılar faşistlərə qarşı mərdliklə vuruşdular. Mozdoku tutmuş düşmən ciddi müqavimətə rast gəlib hücum istiqamətini dəyişdi, Bakıya deyil, Nalçik və Orconikidzeyə doğru yeridi. Mozdok rayonunda döyüşən 402, 416 və 223-cü Azərbaycan diviziyaları 44-cü Sovet ordusunun əsas zərbə qüvvəsinə daxil idi. 77-ci diviziya isə müdafiə əməliyyatlarında istirak edirdi. Mayor Akim Abbasovun komandirlik etdiyi 833-cü polk Mozdok uğrunda döyüşlərdə böyük igidlik göstərdi, düşmənin 30 hücumunu dəf etdi, 36 tankını yandırdı.

1942-ci il oktyabrın əvvəllərində Sovet ordusu Orconikidze yaxınlığında faşistlərin əsas qüvvələrini darmadağın edib onları şimala doğru qovdu. Bakını işğal etmək üçün Parisdən bu

cəbhəyə gətirilmiş 23-cü tank diviziyası, "Branden-burq" polku və Alp diviziyası kimi seçmə hərbi hissələr də məhv edildi.

Şimali Qafqazda Sovet ordusunun əks hücumunda, şəhər və kəndlərin faşist işğalçılarından azad edilməsində 77, 223, 271, 402 və 416-cı Azarbaycan diviziyalarının döyüşçüləri böyük əsgəri hünər göstərdilər. 77-ci diviziya Kerç, Taman yarımadası, Novorossiysk, Mozdok, Mineralnıye Vodi, Stavropol, Lebedi vo Rostov şəhərlərinin və başqa yaşayış məntəqələrinin faşistlərdən azad olunmasında iştirak etdi. 402-ci diviziya Mozdok rayonunda on yaşayış məntəqəsini düşməndən təmizlədi, faşistlərin çoxlu texnika və canlı qüvvəsini məhv etdi. Bu diviziya ağır döyüşlərdə şəxsi heyətinin bir hissəsini itirdiyi üçün 416-cı diviziyaya birləşdirildi. Dekabrın əvvəllərində 416-ci diviziya Novo-Lediyov ve Kapustino yaşayış məntaəqələrini faşistlərdən azad etdi. 1943-cü ilin yanvar-aprel aylarında bu diviziya Mozdok, Qrafskoe Linilin, Stavropol və Armaviri, habelə Azov dənizi sahillərini düşməndən təmizləməkdə fəal rol oynadı. 18-ci ordunun əsgəri Qafur Mammadov Tuapse uğrunda döyüşlərdə igidlik göstərdi, bir döyüşdə 13 faşist əsgərini məhv etdi, həyatı bahasına komandirini ölümdən qurtardı. Ölümündən sonra ona Sovet İttifaqı Qahrəmanı adı verildi. Döyüşlərdə göstərdiyi əsgəri rəşadətə görə 43-cü atıcı briqadanın vzvod komandiri İdris Süleymanov da bu ada layiq görüldü.

Faşist ordularının Qafqazda darmadağın edilməsi ölkənin cənub rayonlarını, o cümlədən Azərbaycanı, ilk növbədə Bakını faşist istilası təhlükəsindən qurtardı, düşmənin bu rayonla, habelə Yaxın və Orta Şərqlə bağlı planlarını pozdu (Mədətov, 1965).

Azərbaycanlılar Stalinqrad döyüşlərində də mərdliklə vuruşdular. İki ay ərzində Baloğlan Abbasovun snayperlər qrupu üç minə qədər əsgəri və zabitini məhv etdi. Döyüşlərdən birində igid komandir qəhrəmanlıqla həlak oldu.

Sovet ordusu 1942-ci ilin qışında əks-hücuma keçib faşist qoşunlarını mühasirəyə saldı. Döyüşlərdə podpolkovnik Həzi Aslanovun 55-ci əlahiddə tank polku böyük qəhrəmanlıq göstərdi. Həzi Aslanova Sovet İttifaqı Qəhrəmanı adı verildi.

Stalinqrad ətrafında 1943-cü ilin fevralında alman-faşist odusu tamamilə darmadağın edildi. Sovet ordusu həmin il ölkənin işğal olunmuş ərazisinin yarısını geri qaytardı. Dünyanın bütün ölkələrində antifaşist hərəkat gücləndi. Faşist bloku daxilində böhran dərinləşdi. Italiyada faşist rejimi dağıldı və bu ölkə müharibədən çıxdı. Antihitler koalisiyası isə, əksinə, getdikcə güclənirdi. Müttəfiqlərin 1943-cü ilin noyabrında keçirdiyi Tehran konfransında faşist Almaniyasına qarşı Avropada ikinci cəbhə açmaq haqqında qərar qəbul edildi.

Sovet ordusunun Qafqaz və Stalinqrad döyüşlərində parlaq qələbəsi müharibənin gedişində əsaslı dönüşün başlanğıcı qoydu. 1943-cü ilin yayında Sovet ordusunun yeni qüvvətli hücumu başlandı. Bütün cəbhələrdə azərbaycanlı döyüşçülər fədakarlıqla vuruşurdular. Oryol şəhəri üzərində qələbə bayrağını ilk dəfə serjant H.Əjdərov qaldırdı, Oryol-Belqorod rayonunda leytenant M.Bağırov, Dnepr uğrunda vuruşmalarda M.Məhərrəmov, S.Kazımov, Kerç körfəzinin keçilməsində M.Quliyev böyük igidliklər göstərdilər.

Hərbi təyyarəçilərdən A.Quliyev, Z.Seyidməmmədova döyüş xidmətləri ilə fərqləndilər. 416-ci diviziya 1943-cü il avqustun 30-da Taqonroq şəhərinin azad ediIməsində böyük qəhrəmanlıq göstərdi və Ali Baş Komandanlığın əmri ilə ona fəxri “Taqonroq diviziyası” adı verildi. Bu diviziya oktyabr ayında Melitopolun faşistlərdən azad edilməsində fərqləndi və "Qırmızı Bayraq" ordeni ilə təltif olundu. Sentyabrın əvvəllərində 271-ci diviziya "Donetsk" əməliyyatında fəal iştirak etdi, göstərdiyi rəşadətə görə ona fəxri "Qorlovka diviziyası" adı verildi.

1944-cü ilda Sovet ordusunun mühüm qələbələri nəticəsində SSRİ ərazisi faşist isğalçılarından tamamilə azad edildi. Həmin il 416-cı Azərbaycan diviziyası 5-ci zərbə ordusunun tərkibində Dneprin keçilməsində, Nikolayev və Kişinyov şəhərlərinin azad olunmasında iştirak etdi. Odessa şəhərinin azad olunmasında fərqləndiyinə göra o, ikinci dərəcəli Suvorov ordeni ilə təltif edildi. 1944-cü il aprelin 13-də 77-ci Azərbaycan diviziyasının döyüşçüləri Simferopolun düşməndən təmizlənməsində böyük igidlik göstərdilər, hissəyə fəxri "Simferopol diviziyası" adı verildi. Bu diviziya Sapun-Qara yüksəkliyinin alınmasında göstərdiyi rəşadətə görə ikinci Suvorov ordeni ilə təltif edildi. 1944-cü ilin yayında 77-ci diviziya Pribaltika cəbhəsinə göndarildi, Pribaltika respublikalarının, Şərqi Prussiyanın faşistlərdən azad olunmasında iştirak etdi.

General-mayor Həzi Aslanovun komandanlıq etdiyi 35-ci qvardiya tank briqadasının Döyüşçüləri 1944-cü il iyunun 23-30-da böyük igidlik göstərərək Berezna çayını keçib Pleşenitsı şəhərini, daha sonra 80 yaşayış məntəqəsini faşistlərdən təmizlədi, düşmənin çoxlu texnikasını va canlı qüvvəsini sıradan çıxartdı. 3cü Belarusiya cəbhəsi asas qüvvələrinin müvəffəqiyyətli hücumu üçün əlverişli şərait yaratdı. Cəbhə komandanlığı Həzi Aslanovun ikinci dəfə Sovet İttifaqı Qəhrəmanı adına layiq görülməsinə təqdimat verdi. Lakin ona ikinci dəfə qəhrəman adı ölümündan 47 il sonra verildi.

Həzi Aslanovun tank briqadası Pribaltikanın azad olunmasında fəal iştirak etdi. Ölkənin rəhbərliyi, xüsusən ordudakı erməni rəhbərlər azərbaycanlılar içərisindən bacarıqlı sərkərdələrin çıxmasını narahatlıqla qarşılayırdılar. Həzi Aslanov 1945-ci il yanvarın 24 də döyüş əməliyyatları getməyən bir yerdə, çox müəmmalı şəkildə ölümcül yaralanaraq həlak oldu.

223-cü Azərbaycan diviziyası Ukraynanın canub rayonlarının, Kişinyovun azad olunmasında, Yassi-Kişinyov əməliyyatında fərqləndi (Azərbaycan SSR Böyük Vətən müharibəsi illərində - 1941-1945, 1976).

Müharibə illərində əsir düşmüş, faşist hərbi əsir düşərgələrinə salınmış azərbaycanlıların bir hissəsi faşizmə qarşı mübarizəni davam etdirir, qaçıb partizan dəstələrinə qoşulurdu. Ələkbər Əliyev 1941-ci ildə Belarusiyanın Belotsk rayonunda partizan dəstəsinin taşkilinda fəal iştirak etmişdi. 1942-ci ildən o, "Dyadya Kolya" partizan birləşməsində dəstə qərargahının rəisi, 1944-cü ildən Suvorov adına partizan dəstəsinin komandiri olmuşdu. Dəstə tez-tez faşist qarnizonuna hücum edirdi. Partizanlar düşmənin 1 hərbi eşalonunu, 3 təyyarəsini partlatmış, Berlin–cəbhə telefon xəttini 28 dəfə kəsmiş, yüzlərlə faşisti məhv etmiş, Almaniyaya aparılan 4 mindən çox sovet adamını əsirlikdən qurtarmışdı. Kapitan İsmayıl Əliyev 1942-ci ilin oktyabrından Kalinin vilayətində fəaliyyat göstərən partizan briqadasının qərargah rəisi idi. 50 nəfər azərbaycanlı hərbi əsir zabit Məmməd Əliyevin başçılığı ilə 1943-cü ilin sentyabrında faşist düşərgəsindən qaçaraq Krımda xüsusi 8 saylı Azərbaycan partizan dəstəsi yaratmışdı. Həmin ilin payızında daha 400 nəfər azərbaycanlı əsirlikdən qaçıb Ukrayna meşələrində Şors adına partizan dəstəsi təşkil etmişdi. 1944-cü ildə A.Məhərrəmov və H.Narciazovun başçılıq etdikləri Uritski adına partizan dəstəsi ilə birlikdə Karpatda Dobşina kəndi yaxınlığında faşistlərin təyyarə meydanına qəfil hücum etmiş, düşmənin 21 hərbi təyyarəsini, 70-dək zabit və əsgərini sıradan çıxarmışdı.

1944-cü ildə bu partizan dəstələri başqa partizan hissələri ilə birləşdi, Ukrayna, Çexoslavakiya, Macarıstan və Polşada faşistlərə qarşı mübarizədə fəal iştirak etdi. Onlar düşmən arxasında 11 min km döyüş yolu keçdi, 2,5 mindən çox faşist əsgər və zabitini, düşmənin 32 təyyarəsini, 50-dən çox eşalonunu məhv etdi, onlarla körpünü, dəmiryol xəttlərini sıradan çıxartdı. S.A.Kovpakın məşhur partizan ordusunda B.Dadaşov, A.Aliyev cəsur döyüşçülər kimi tanınmışdılar. Ukrayna partizan dəstələrində 500, Belarusiya partizan dəstələrində isə 100-dən çox azərbaycanlı döyüşçü igidliyə görə təltif olunmuşdu (Mədətov, 1976).

Faşizmə qarşı Avropa xalqlarının partizan müharibəsində də azərbaycanlılar iştirak etmişdilər. Zabitlər Hadı Qiyasbəyov və Mirzəxan Məmmədovun başçılıq etdikləri azərbaycanlı əsirlər 1942-ci ilin yazında Polşanın Edlin şəhərindəki hərbi əsir düşərgəsində gizli antifaşist təşkilat yaratmışdılar. Payızda bu təşkilatın köməyi ilə zabitlər Z.Zeynalov və H.Novruzovun rəhbərliyi ilə bir qrup əsir qaçıb Polşa partizanlarına qoşulmuşdu. Hitlerçilər 1943-cü ilin əvvəllərində bu təşkilatın izinə düşə bildilər. H.Qayıbov bir dəstə əsir ilə qaçıb cəbhə xəttini keçərək Sovet ordusu hissələrinə qoşula bildi. Ələ keçənlərin bir hissəsi Fransadakı ölüm düşərgələrinə göndərildi. Gizli təşkilat Rodez şəhərindəki ölüm düşərgasində də fəaliyyətini M.Məmmədovun rəhbərliyi ilə davam etdirdi (6).

Təkcə 1944-cü ilin mart-aprel aylarında bu düşərgədən 200 əsirin qaçırılması təşkil olunur. Həmin ilin baharında gizli təşkilat Fransa Müqavimət hərəkatı rəhbərliyi ilə əlaqə yaradır. Avqustun 15-də üsyan qaldırıb fransız partizanlarına köməyi ilə düşərgəni məhv etmək planlaşdırılmışdı. Lakin üsyan başlayacaq vaxtdan bir neçə saat əvvəl faşistlər xəbərdar olmuş və üsyanın qarşısı alınmışdı. Gizli təşkilatın rəhbərləri tapılıb güllələnməyə məhkum edildilər. Lakin onlar əsirləri güllələnməyə aparan nəzarətçilərə hücum etdilər, nəticədə 5 nəfər, o cümlədən M.Məmmədov öldürüldü, qalanları isə qaçıb partizanlara qoşuldular. Fransadakı hərbi əsir düşərgələrindən qaçmış azərbaycanlı döyüşçülər 1-ci Sovet partizan polkuna daxil oldular va Fransanın Rodez, Larzak,

Kursak, Mond, Nim və başqa şəhərlərinin, onlarla kəndlərinin faşistlərdən azad edilməsində fəal iştirak etdilər. Ə.Cobrayilov, A.Abdullayev, X.Hacıyev, R.Rzayev və başqaları Fransa Müqavimət hərəkatında mühüm rol oynadılar (7).

1942-ci ilin noyabr ayında Fransada faşistlərin ölüm düşərgəsindən qaçıb partizanlara qoşulmuş Əhmədiyyə Cəbrayılov "Armed Mişel" adı ilə bu ölkənin azadlıq hərəkatında fəal iştirak etmiş, şəxsi igidliyə görə parada əsgərə generaldan irəlidə getmək kimi şərəfli hüquq verən yüksək mükafat -"Hərbi medalla" təltif olunmuşdu.

Yüzlərlə azərbaycanlı döyüşçü İtaliya və Yuqoslaviyanın azadlığı uğrunda partizan hərəkatında fəal iştirak etmişdi. Onların böyük bir dəstəsi Yuqoslaviya Xalq Azadlıq ordusu IX korpusunun tərkibində 9 ay döyüşmüş sovet partizan batalyonunda vuruşurdu. Bu döyüşçülərdən 50 nəfəri rəşadətinə görə Yuqoslaviyanın orden və medalları ilə təltif olunmuşdu.

1942-ci ilin avqustunda ağır yaralanaraq əsir düşmüş, almanların təşkil etdiyi milli Azərbaycan legionuna daxil olmuş, lakin tezliklə faşistlərin əsil niyyətini başa düşərək qaçıb əfsanavi "Mixaylo" düşmənə qarşı qahrəmanlıqla mübarizə aparırdı. Yuqoslaviya Xalq Azadlıq ordusu diversiya qrupuna rəhbərlik edən M.Hüseynzadə və onun dəstəsinə daxil olan T.Əliyev, M.Seyidov, A.Məmmədov, D.İsmayılov və başqaları sloven partizanları ilə birlikdə faşistlərə böyük itkilər verdilər, müxtəlif əməliyyatlarda mindən çox alman zabitini məhv etdilər. Faşistlər Mixaylonun başına 400 min lira mükafat ayırmışdılar. 1944-cü ilin noyabrında o, növbəti əməliyyat zamanı mühasirəyə düşdü və ələ keçməsin deyə, özünü öldürdü. 1957-ci ildə ona Sovet İttifaqı Qəhrəmanı adı verildi (8).

## Nəticə

Faşist hərbi düşərgələrindən qaçmış əsirlərin İtaliyada təşkil etdiyi partizan dəstələrindən birinə Ə.Babayev rəhbərlik edirdi. Şimali İtaliyanın faşizmdən azad edilməsi uğrunda döyüşlərdə V.Hüseynov, A.Mirzəyev, S.Məcidov və başqaları fərqlənmişdilər. Cəsur pulemyotçu Vilayət Hüseynov İtaliya faşistlərinin başçısı Mussolinini həbs edən partizanlar arasında olmuşdu.

Leytenant Hacıbəyov Çexoslovakiyada "Oraq və çəkic" adlı partizan dəstəsinin təşkilində və fəaliyyətində yaxından iştirak etmişdi. Almaniyada Veymar ətrafındakı "Buhen-vald" ölüm düşərgəsində fəaliyyat göstərən gizli antifaşist təşkilatın fəal üzvlərindən biri də gənc azərbaycanlı Əkbər Ağayev idi. Ələ keçdikdə faşistlər onu ağır işgəncələrlə öldürdülər. "Mauthauzen", "Dahau" və başqa faşist ölüm düşərgələrində də əsirlərin gizli antifaşist təşkilatlarında azərbaycanlılar fəal iş aparırdılar.

## Ədəbiyyat

1. Orucov, Q. (1984). Azərbaycan Qafqaz döyüşlərində. Bakı.
2. İsmayılov, S. (1991). Azərbaycan Moskva uğrunda döyüşlərdə. Bakı.
3. Mədətov. Q (1965). Azərbaycan Böyük Vətən müharibəsi illərində (1941-1945-ci illər). Bakı.
4. Azərbaycan SSR Böyük Vətən müharibəsi illərində - 1941-1945. (1976). I Hissə. Bakı.
5. Mədətov, Q. (1976). Sovet İttifaqı Qəhramanı Mehdi Hüseynzadə. Bakı.
6. https://sia.az/az/news/politics/952406.html
7. http://anl.az/el/emb/QELEBE-75/kitablar/Az_2-ci-dunya-muharibesinde.pdf
8. https://ikisahil.az/post/qafqazdan-berlinedek-azerbaycanlilarin-misilsiz-qehremanliqlari

Göndərildi: 11.03.2019 Qəbul edildi: 26.06.2019

DOI: https://doi.org/10.36719/2706-6185/01/13-18

**Əli Umud oğlu Əliyev**
Azərbaycan Dövlət Pedaqoji Universiteti, Ağcabədi filialı
filologiya üzrə fəlsəfə doktoru
eli.eliyev.54@mail.ru

# ERMƏNİLƏRİN SAXTALAŞDIRMA SİYASƏTİNƏ TARİXİ BAXIŞ

**Xülasə**

Erməni milləti əsrlər boyu Rusiya imperiyasının, daha sonra isə Sovet imperiyasının dəstəyi ilə Azərbaycan torpaqlarında məskunlaşaraq hər cür məkrli addımlar ataraq, onu özlərinə çevirməyə çalışıb. Tarixi araşdırmalar göstərir ki, ermənilər Qafqaz Albaniyasına sonradan gəliblər. Onlar daim Albaniyanın erməni tayfası ilə assimilyasiya olunurlar. Albanların xaçı öz-özünə təsvir edilmiş, əksinə qədim albanların və sonrakı azərbaycanlıların təfəkkürünə həkk olunmuşdur. Bu məqsədlə İslam amilindən istifadə ediblər. Və bu amil onlara Qafqaz Albaniyasının bugünkü tarixini yenidən müəyyənləşdirməyə imkan verib. Halbuki, ölkəmizin ərazisində mövcud olan toponimlər, xalqda arasında işlənən bir çox sözlər millətimizin xaça sitayiş etdiyini sübut edir.

Ümumiyyətlə, ermənilərin əsas xüsusiyyəti və siyasi xətti bu diyarın ətraf torpaqlarını və mədəniyyətlərini özünü aktuallaşdırmaq yolu ilə öz "qədim tarixlərini" yazmaq idi. Bunun sübutu erməni dili, mətbəxi, musiqisi və s. göstərilə bilər.

***Açar sözlər:*** *Qafqaz Albaniyası, Alban xaçı, ərmən tayfası, haylar, millət, xalq, ermənilər*

**Ali Umud Aliyev**
Azerbaijan State Pedagogical University, Agjabadi branch
Ph.D in Philology
eli.eliyev.54@mail.ru

## Historical review to the armenians's falsifing policy

**Abstract**

For centuries, the Armenian nation, with the support of the Russian Empire and then the Soviet Empire, settled in the lands of Azerbaijan, taking all sorts of insidious steps and trying to make it their own. Historical investigations show that Armenians came to the Caucasus Albania later. They constantly assimilated with the Armenian tribe of Albania. The Albanians' cross has been self-portrayed, and in the contrary has been engraved in the thinking of ancient Albanians and later Azerbaijanis. To this end, they have used the Islamic factor. And this factor has allowed them to redefine the history of Caucasian Albania today. However, the toponyms that exist on the territory of our country, and many of the words used in the nation, prove that our nation was worshiping to a cross.

In general, the main feature and the political line of the Armenians was the writing of their own "ancient history" by way of self-actualization of the surrounding lands and cultures of this land. Proof of this is Armenian language, cuisine, music and so on. can be shown.

***Keywords:*** *Caucasian Albania, Albanian cross, armenian tribe, hays, nation, people, armenians*

## Giriş

XIX əsrin əvvəllərində Rusiya Azərbaycanı işğal etdikdən sonra öz hökmranlığını möhkəmlətmək və işğal etdiyi ərazilərdə manqurtlaşdırma siyasəti yeritmək, münaqişə ocaqları yaratmaq kimi perspektiv planlar qarşıya qoymuş və bu planları uğurla yerinə yetirmişdir. Belə bir "parçala hökm et" siyasətini erməni siyasəti adlandırıram. Ümumiyyətlə, Azərbaycan türk millətinə, dövlətçiliyinə, ərazi bütövlüyünə qarşı çevrilmiş hər bir ideya və ideologiyanı erməni siyasəti kimi dərk edirəm. Bu erməni siyasətinin məqsədi hansı yolla olursa olsun Azərbaycan türk millətini yox

etmək, Azərbaycan torpaqlarını özününküləşdirmək üçün müxtəlif üsullara, variantlara əl atmaqla Azərbaycanı xəritədən silməkdir.

Ərmən Alban tayfası imiş. Bütün Türk tayfaları ilə və eləcə də Albanlarla düşmən mövqedə olan haylar Ərmən tayfasının xristian olmasından istifadə edərək həmin tayfanın adı altında gizlənmişlər. Ona görə belə etmişlər ki, Alban torpaqlarına sahib dursunlar, vətənsiz bir tayfa olaraq özlərinə vətən tapsınlar. Bu ideya onların daimi olaraq xain xislətini tənzimləyən atribut kimi səciyyələnir. Ərmən Alban tayfası İrəvan xanlığının ərazisində yerləşirmiş. Gəlmə tayfa olan haylar Ərmən tayfasını assimliyasiya etmişdir. Ərmən Alban tayfası ilə düşmən mövqedə olan haylar daimi olaraq Alban tayfalarını təqib etmiş, qırğınlar törətmiş, tarixin yaddaşında silinməz izlər qoymuşlar. O qədər haylar Türk tayfalarını qovmuşlar ki, bu gün də tələsik bir iş gördükdə-«nə olub, hay gəlir?!» deyirlər. Yəni ən qaddar düşmən və quduz xalq haylar daimi olaraq türklərin qənimi olmuşdur.

Ərmən sözünün mənası mən igidəm deməkdir. Filologiya elmləri doktoru, professor Sadiq Şükürov da belə bir doğru nəticəyə gəlmişdir ki, "ərmən" sözü xalis türk sözüdür. Hay tayfaları Ərmən Alban tayfasını tarixən assimliyasiya etmiş və Ərmən adını özləri üçün millət adı seçmişlər. Onlar «ərmən» adını «erməni» formasında qəbul etmişlər. Xalq arasında belə bir fikir dolaşır ki, guya «er-yer, «məni»-mənim (yer mənimdir) deməkdir. Daimi olaraq yer iddiasında olduqları üçün belə ad seçiblər.

İrəvan sözünü də Yerevan etmişlər. Bu sözdə də daimi yer iddiasında olan haylar «yer» sözündən əl çəkməmişlər. Bu gün erməni dediyimiz xəyanət çamurluğu qədim dövrdə hay və yaşadıqları ərazi isə Hayıstan adlanırmış.

"...erməni kilsəsi Albaniyada ölkəni erməniləşdirmək aləti olmuşdur... Erməni kilsəsi "Albaniyanın bütün kilsələrində sülh"ü yalnız yadelli işğalçıların köməyi ilə bərqərar edirdi, erməni katolikosluğunun mənafeyi hər dəfə tələb etdikdə erməni kilsəsi həmişə yadelli işğalçılarının köməyinə əl atır, "xaç bayrağı ilə öz yolu üzərində tarixi Albaniya və onun bir hissəsi olan Qarabağ (Arsax) xalqlarını "yox edirdi" (Kalankatuklu, 1993: 11).

Ermənilər Albanlardan bizi uzaqlaşdırıb özlərini Alban yurdunun varisləri elan ediblər. Xaça, xristianlığa qarşı bizdə kin-kidurət oyadıb özləri isə sonradan xristian və xaçik olublar. Halbuki Albanlar xristianlığı ermənilərdən 270 il əvvəl qəbul etmişlər. Bu gün də dədə-babalardan bizə yadigar qalmış adət və ənənələrdə xaça tapınma özünü göstərir. Məsələn, atlarda bəd xassəli şiş olduqda onun üstünə xaç şəkilli dağ çəkirlər ki, bədxassəli şiş çəkilsin, yox olsun. Yəni xaç xeyir qüvvə kimi qəbul edilir. Və yaxud bu gün də çörək bişirilərkən onun üzərinə xaç işarəsi çəkirlər. Ulu soylarımızın çoxunun damğası xaç şəklində olmuşdur. Qədim onomastik adlarımızın xaçla bağlı olması fikrimizi bir daha sübut edir: Məs: Xaçınyalı kəndi, Xaçın çayı, Xaçbulaq yaylağı, Zümürxaç kəndi, Xaçmaz rayonu və s.

Ermənilər Azərbaycan xalqına qarşı yürütdüyü məhvetmə siyasətində ərəblərlə, farslarla bir nöqtədə birləşirlər. Belə ki, İslam dinini qılınc gücünə Azərbaycan xalqına qəbul etdirənlər bu xalqı ilkin mənəviyyatından, soy kökündən, inam və inancından, dinindən ayırıblar. Ermənilər də başqa prizmadan yanaşıb Azərbaycan xalqında xristianlığa qarşı, xaça qarşı ikrah hissi oyadıblar. Bax bu iki məqam eyni nöqtədə birləşir. Hər iki yanaşmanın məqsədi Azərbaycan xalqını öz soy kökündən uzaqlaşdırmaqdır. Ermənilərin isə bu məsələyə belə yanaşmalarının iki məqsədi vardır. Birincisi Azərbaycan xalqının tarixən düşməni olan erməni bu xalqı məhv etmək, manqurdlaşdırmaq istəyir, ikincisi isə ondan irəli gəlir ki, özləri Azərbaycan xalqının soy kökü olan Alban tayfasının birinin adı altında gizlənmiş "hay" dır. Ona görə də Azərbaycan xalqını soy kökündən uzaqlaşdırmağa hər an cəhd göstərir. Məlumdur ki, Albaniya 26 tayfanı əhatə etmişdir. Bu 26 tayfanın əksəriyyəti Türk tayfaları olmuşdur. Alban tayfaları Albaniya ərazisinin sahibi imiş. Bu ərazilərdə "hay" tayfası yaşamayıbdır. "Hay"ların bu məkanda tarixən əraziləri olmayıb. Lakin bu ərazilərə köçürülən "hay"lar özlərinə əbədi məkan seçmək üçün "Ərmən" Alban tayfasının adı altında gizlənib, Albaniyanın Ərmənlər yaşayan Ərməniyyə torpaqlarına sahib durublar. Odur ki, onlar heç vaxt razı olmazlar ki, Azərbaycanlılar öz soy kökünə bələd olsunlar və xristian dininin onlardan əvvəl qəbul etmiş babalarını tanısınlar. Axı tarixdən məlumdur ki, Albanlar xiristianlığı "hay"lardan 270 il əvvəl qəbul ediblər. Həmçinin bir də ona görə "hay"lar Ərmən Alban tayfasının adı altında

gizlənmişlər ki, həm özlərini Albanların varisləri saysınlar, həm də guya xristianlığı əvvəlcədən qəbul etdiklərini sübut etsinlər. Alban tayfalarından bu günümüzə qədər öz mədəniyyətini qoruyub saxlayan və bu gün də öz qədim Alban milli qüruru ilə yaşayan İngiloylar Azərbaycanda l4,9 min nəfərdir. "ingiloylar (14.9 min nəfər, 1999) dini mənsubiyyətinə görə xristian (gürcü pravoslav kilsəsi) və müsəlman ingiloylara ayrılır. Müsəlmanlar Zaqatala rayonunun Əliabad, Mosul və Balakən rayonunun İtitala kəndlərində, xristian ingiloylar isə Qax rayonunun 9 kəndində yaşayırlar. Qədimdə onların yaşadıqları ərazi Kambisena (Ereti) adlanırdı və əsas əhalisi ingiloyların əcdadları hesab olunan er və qel tayfalarından ibarət idi. Burada Alban kilsəsi fəaliyyət göstərirdi. İngiloyların bir hissəsi sonradan zorla gürcüləşdirilmiş Alban tayfalarının qalıqlarıdır" ("AMB", 2007: 107).

Verilmiş sitatdan aydın olur ki, er tayfası Alban tayfası olmuşdur. Haylar bu tayfanın adı altında gizlənmişlər.

Lakin tarixi nə qədər saxtalaşdırsalar da, tarixin daş yaddaşı həqiqəti üzə çıxarır. Bunu ermənilərin öz yazarları da qələmə almışlar. O.Kapantsyan "Xayasa-kolibel armyan" (Yerevan, 1948) əsərində qeyd etmişdir ki, ermənilər VII əsrədək Kiçik Asiyada Hayasa adlı əyalətdə yaşadıqlarına görə "hay" adlandırılmışlar. Buradan aydın olur ki, bunlar erməni deyil haydırlar. Bu gün də onlar bir-birindən millətini soruşduqda–hayes? -(ermənisən?) -deyirlər.

Müasir elmi araşdırmaya əsasən erməni adlandırdığımız bu riyakarlıq çamurluğu Hind-Avropa mənşəli friqlərin bir qoludur. Ulu əcdadları eradan əvvəl XII əsrdə Balkanlardan Kiçik Asiyaya köçmüş, Hayase əyalətində məskunlaşmış e.ə. VII əsrdə Urartu dövlətinə qatılmışlar. Urartulular onların bir hissəsini indiki Ermənistan ərazisinə köçürmüşlər.

Buradan aydın olur ki, erməni adlandırılan xalqın adı "hay"dır və yaşadıqları ərazi isə "Hayistan" adlanırmış. Ermənistan ərazisinə gəlmədirlər. Ermənistan Qədim Alban tayfası olan Ərmənlərin yaşadıqları Ərməniyyə torpaqlarıdır.

Belə bir nəticəyə gəlmişəm ki, erməni dili də qədim alban dili əsasında formalaşıbdır. Alban mədəniyyəti bizə erməni dilində gəlib çatmışdır. Erməni kimi tanınan bu xalq Ərməniyyə torpağına yiyələnmiş haylardır.

Bu fikri Alban dilini, mədəniyyətini əlifbasını, ümumiyyətlə, Alban izini yer üzündən silib erməniləşdirən hayların tarixi gedişləri, durumları və xarakterik xüsusiyyətləri şərtləndirir. "Mingəçevirdəki qazıntı zamanı tapılan Alban əlifbası parçaları təsdiq edir ki, V-VII əsrlərdə Arranın öz yerli yazısı var idi və bu yazı ölkədə ərəb hökmüranlığı daha qurulmazdan əvvəl mövcud olmuşdur...Arranda yazılı mənbələr və ədəbiyyat xəlifə Əbd ül-Malikin (685-705) hökmranlığı dövründən başlayaraq məhv edilmiş və ya sıxışdırılıb aradan çıxarılmışdır. Divanxanalar ərəb dilinə keçdi, Alban yazısı, habelə fars və Xarəzm yazıları, əhali içərisində savadlı təbəqələrin azlığı və qriqoryan kilsəsinin təzyiqi üzündən sıxışdırılıb unuduldu və təbii olaraq məhv oldu. Erməni dili Alban dilini əvəz etdi" (Bünyadov, 1989: 58).

Bizim dövrümüz çoxəsirlik dünya qazanında bişmiş sinxronik bir aləmdir. Biz bu aləmdə şamanlıq, büdpərəstlik, hər bir şeyə tapınma, xristianlıq, islamçılıq və s. anlamları görə bilərik. Tarixin inkişaf xətti və fəlsəfi duyum, bunu bizə imkan verir deyək ki, bütün bəşəriyyətin son nöqtədə birləşmə ehtimalı labüddür. Çünki bəşər övladının başlanğıcı və sonu eyni nöqtədə dərk olunur. Yuxarıda söylənilən fikirlərin təsdiqini görkəmli filoloq alim, əməkdar elm xadimi, mərhum professor Mirəli Seyidovun "Azərbaycan xalqının soykökünü düşünərkən" əsərində tapa bilirik. M.Seyidov yazmışdır: "...Azərbaycan dilli qəbilələrin, qəbilə birləşmələrinin eradan on dörd yüz il qabaq Azərbaycanda yaşaması haqqında bilgi vardır. Sonrakı yüzilliklərdə (IV-III) onlar burada elliklə, yaşamış və vaxtaşırı el-el buraya gəlib qohum, qardaş qəbilə birləşmələrinə qaynayıb-qarışmışlar.

Burada yaşayan və eradan qabaq axınla gələn türkdillilərin dili azı–azı eranın ilk yüzilliklərindən tutmuş ümümxalq danışıq dili qatına yüksəlirdi. Belə olmasaydı, aşağıda görəcəyimiz kimi, V yüzillikdə "Dəli Domrul boyu" Qafqazda, xüsusilə Ermənistanda, Gürcüstanda yayılmazdı və onun yaxından iştirakı ilə əsərlər yaranmazdı. Musa Qağanqatlı (VII əsr) əsərində göstərir ki, hələ eranın V yüzilliyində Qazan xan və onun qardaşı haqqında tarixi əfsanə ola bilsin elə lap əsl əfsanə varmış və tarixçi onu az-çox dəyişikliklə əsərinə salmışdır. Ola bilsin ki,

Qazanxan əfsanəsini tarixiləşdirmişdir. Deməli Dəli Domrul əfsanəsi, Qazan xan tarixi əfsanə hələ V yüzillikdə Qafqazda Azərbaycan dilində yayılıbmış. Çoxdan eradan 14 yüz il qabaq yaşamış və sonradan axın halında gələnlər Qafqazda türk dilinin qatını daha da artırmış və bu da Azərbaycan dilinin yayılma arealını genişləndirmişdir, tarixi şərait, ictimai mühit ətrafdakı dillərə təsir etməyə, qarşılıqlı ilişgilərə əsas yaratmışdır. Belə bir durumda mədəni, dil bağları daha da genişlənirdi. Eranın ilk yüzilliklərindən böyük axınla xəzərlər, az sonra hunlar və b. qəbilə birləşmələri xalqlar Qafqaza gəlirlər. Türk qatı böyüyür, genişlənir, ictimai durumu daha da möhkəmlənir. Belə bir durumun qonşu dillərə, xüsusilə erməni dilinə təsiri özünü açıqca göstərir. Bu dil hadisəsini duyan görkəmli bilici H.Acaryan əlli ildən çox müasir erməni dili (aşğarapar) ilə əski erməni dili (qrapar) arasındakı böyük, ciddi ayrılıq, fərq haqqında düşünmüş və axırda yazmışdır:

"Erməni dili strukturunun (sintaksis nəzərdə tutulur) quruluşuna görə öz çevrəsində olan və onu işğal edən dillərin-latıncanın, yunancanın fransızcanın, ərəbcənin, assoricənin və hətta kürdcənin strukturuna quruluşuna uyğun ola-ola birdən–birə bunlardan uzaqlaşır və türk-tatar dillərinin strukturuna oxşayır? Bu oxşayış tamam təsadüfdürmü? Erməni dilinin struktur quruluşunun dəyişilməsinin səbəbləri yoxdurmu?"

H.Acaryan erməni dilindəki böyük dəyişikliklərdən bəhs edərək yazır ki, hər kəs qraparla aşğarapan müqayisə edərsə ən kiçik məsələdə belə böyük müxtəlifliyi, fərqi görər. Müəllif fikrini isbat etmək üçün bir çox qrammatik məsələləri misal çəkir. O, feildə, təyində və s. dəyişiklikləri göstərir. Erməni dilinin quruluşundakı ciddi dəyişikliyə H.Acaryan VII yüzilliyin tarixçisi Hovhonnes Mamikonyanın, XI yüzilliyin şairi Heraqasinin dilində tuş olarkən təəccüblənmişdir.

Bizcə, Hovhannes Mamikonyamn dilindəki dəyişiklik təbii dil hadisəsidir. Əgər Mamikonyanların köklərinin uyğurlarla qan qohumluğu göz qarşısına gətirilərsə, onda məsələ az-çox aydın olar. Görünür ki, türkdilli Mamikonyanlar erməniləşərkən qraparın qrammatik quruluşunda istər-istəməz dəyişiklik etmişlər" (Kalankatuklu, 1993: 436).

Buradan bir daha aydın olur ki,ermənilər türk tayfasının adı altında gizlənib dilinin qrammatik strukturunu da türk dilinin təsiri altında formalaşdırıblar (Əliyev, 2009: 56-61).

"Aparılan araşdırmalar və tədqiqatlar nəticəsində aydın olur ki, ermənilər müxtəlif vaxtlarda gah Əhəməni fars imperiyasının gah Makedoniyalı İsgəndərin, gah Azərbaycan-Atropatenanın, gah da türklərin hakimiyyəti altında olmuşlar. Onu da qeyd etmək lazımdır ki, ermənilər hansı dövlətin ərazisində yaşayırdısa, o dövlətin tarixini özününkü kimi qələmə verməyə, ona şərik çıxmağa başlayırdılar. Mənbələrin birində qeyd edilir ki, beləliklə, "süni şəkildə yazılan və təbliğ olunan erməni xalqının tarixi həqiqətdə ayrı-ayrı erməni olmayan etnik feodalların tarixidir" (Məmmədov, Məmmədov, 2008: 25).

Azərbaycanlı dedikdə Azərbaycanda yaşayan Azərbaycan xalqı nəzərdə tutulur. Burada gürcü, erməni, rus, ləzgi, türk, kürd və s. millətlər yaşayırlar. Gürcüstanlı dedikdə orada yaşayan bütün millətlər (gürcülər, ermənilər, ruslar Azərbaycan türkləri və s.) nəzərdə tutulur. Eləcə də rusiyalı, polşalı macarıstanlı və s. dedikdə orada yaşayan bütün millətlər nəzərdə tutulur. Odur "ki, "azərbaycanlı" ifadəsi də sovet dönəmində millətimizin adının unudulması üçün işlədilmiş erməni siyasətinin bir variantıdır. Çünki "böyük Ermənistan" sovet ideologiyasına əsasən Azərbaycan türkü yox edilməli, bir millət kimi dərk olmamalı idi. Əgər belə olmasaydı gürcüstanlılar içərisində gürcülər ermənistanlılar içərisində erməni milləti, rusiyalılar içərisində rus milləti və s. olduğu halda azərbaycanlılar içərisində bizim millətin adı nədir?! Sovet imperiyası 70 il ərzində Azərbaycanda xalq, Ermənistanda isə millət fomalaşdırmışdır (Şükürov, 1999: 78-80).

Amma bu gün biz bir millət kimi Azərbaycan türkü adlanmalıyıq, öz Dədə Qorqud adımızı özümüzə qaytarmalıyıq. Azərbaycanlı olmağı ilə Azərbaycanda yaşayan bütün millətlər fəxr edə bilər. Çünki Azərbaycan dünyanın cənnət məkanıdır. Bütün millətlər burada yaşamaq və azərbaycanlı olmaq arzusundadır. Ulu öndərimiz Heydər Əlirza oğlu Əliyev bu barədə demişdir: "Mən azərbaycanlı olmağımla fəxr edirəm!" Bu fıkir həm də Azərbaycan türkü ifadəsi mənasında işlədilmişdir. Odur ki, mən də ulu öndərimizin söylədiyi fikrin davamı olaraq bir millətin nümayəndəsi kimi, yəni Azərbaycan türkü olmağımla fəxr edirəm. Azərbaycan dilində bütün millətlər danışa bilər, lakin bu dili Azərbaycan türk millətinin Azərbaycan türkü qorumalı, sevməli və bütün dünyada təbliğ etməlidir. Çünki bu dil Azərbaycan türk dilidir.

Azərbaycan xalqı çoxmillətli tərkibə malikdir. Azərbaycanda əhalinin milli tərkibə görə 90,6 %-ni Azərbaycan türkləri təşkil edir. Lakin burada "başqa millətlərin nümayəndələri" əvəzinə "başqa xalqların nümayəndələri" ifadəsi işlədilir ki, bu ifadə də yanlışdır. Çünki hər bir dövlətin öz xalqı və xalqının milli tərkibi vardır. Ona görə də hər bir dövlətin, xalqının milli tərkibi də müxtəlifdir. Bu baxımdan ayrı-ayrı xalqların milli–tərkibi Azərbaycanda ola bilməz. Odur ki, Azərbaycanda ayrı-ayrı xalqların deyil, millətlərin nümayəndələri yaşayırlar. Burada rus, ləzgi, gürcü və s. millətlərin nümayəndələri vardır ki, sovet dövründə bunlara "az saylı xalqlar" deyirdilər. Bu ifadə də yanlışdır. Xalqın içərisində millətin say tərkibinə görə az və ya çoxluğu ola bilər. Odur ki, Azərbaycanda 7953,9 mln. nəfər xalqın milli tərkibə görə sayı (1999-cu il siyahıya alınmaya əsasən) aşağıdakı kimidir.

| sayı (min nəfərlə) | | Yekuna nisbətən % lə |
|---|---|---|
| 1.Azərbaycan türkləri– | 7205,5 mln. nəfər | 90,6 |
| 2.Ləzgilər– | 178,0 | 2,2 |
| 3.Ruslar– | 41,7 | 1,8 |
| 4.Ermənilər– | 120,7 | 1,5 |
| 5.Talışlar– | 76,8 | 1,0 |
| 6.Avarlar – | 50,9 | 0,6 |
| 7.Türklər– | 43.9 | 0,5 |
| 8.Tatarlar– | 30,0 | 0,4 |
| 9.Ukraynalılar– | 29,0 | 0,4 |
| 10. Saxurlar– | 15,9 | 0,2 |
| 11. Gürcülər– | 14,9 | 0,2 |
| 12. Kürdlər– | 13,1 | 0,2 |
| 13. Tatlar– | 10,9 | 0,3 |
| 14. Yəhudilər– | 8.9 | 0,1 |
| 15. Udinlər – | 4,2 | 0,12 |
| 16. Digərləri– | 9,5 | (1,95) |

Burada milli tərkibi və sayı göstərilən bu millətlər Azərbaycanda yaşadıqları üçün azərbaycanlı adlanırlar və bunlar Azərbaycan xalqını təmsil edirlər. Göründüyü kimi azərbaycanlı dedikdə ən azı 16 millət nəzərdə tutulur ki, bu da 7953,4 min nəfər Azərbaycan xalqı deməkdir. Bunların içərisində isə Azərbaycan türkləri 7205,5 min nəfər təşkil edir, 747,9 min nəfər isə digər millətlərin nümayəndələridir.

Qətranı qaynatsan da şəkərə çevrilə bilmədiyi kimi, başqa millətlərin adını, soyadını dəyişməklə türkləşə bilməz. Ona görə də hər bir millətin öz adı, soyadı və xisləti vardır. Erməni Azərbaycanda yaşayıb, adını və soyadını dəyişib, "Həcər südü əmmişəm, babam Koroğludur, Nəbidir, Cavanşirdir" deməklə türkləşmir, əslində millətimizi təhqir edir.

Erməni siyasətinin növlərindən biri də Azərbaycan ərazisində türk soykökü ilə bağlı onomastik vahidlərin məqsədli şəkildə dəyişdirilməsi olmuşdur. Məsələn, Gəncə-Yelizavetpol və yaxud Kirovabad, Şəki-Nuxa, Beyləqan-Jdanov, Tərtər-Mirbəşir, Qəbələ-Qurtqaşen. Oğuz-Vartaşen və s. yer adları dəyişdirilərək ilkin həqiqi anlamından uzaqlaşdırılmaqla doğma soy leksikasına biganəlik, unutqanlıq psixologiyası aşılamışlar. Həmçinin başqa millətlərdən olan azlıqlara muxtariyyət verməklə bərabər onların yerləşdiyi əraziləri sanki özəlləşdirib, təmizləmə aparmaqla, oradakı adları da dəyişdirib azərbaycansızlaşdırmaq məqsədi güdmüşlər. Erməni yaşadığı əraziləri erməniləşdirsə, dərd yarıdır. Hətta yaşamadığı ərazilərin də adlarını dəyişib, Azərbaycan torpaqlarına erməni damğası vururlar. Azəbaycanda hara ayaq basırlarsa, orada erməni xaçı basdırır, alban xaçlarını erməniləşdirirlər, bir sözlə, erməni siyasəti yürüdürlər. Bu siyasət Azərbaycanda daimi olaraq qədimdən bu günə kimi davam etdirilmişdir. Bu erməni siyasətinin yalnız bir məqsədi olmuşdur: Azərbaycanı özününküləşdirmək və Azərbaycan türklərini yox etmək. Bu siyasəti rus çarizmi hər vasitə ilə tətbiq etməyə çalışmışdır. Bəzi sərhəd zonalarında iddialı

millətləri yerləşdirməklə, yer adlarını dəyişməklə erməni siyasətinin rus variantını həyata keçirmişlər (Seyidov, 1989: 83).

## Nəticə

Ümumiyyətlə, Azərbaycanda Azərbaycançılıqdan kənar nəyə əl atılırsa, bu erməni siyasətinin bir variantıdır. Biz ayrı-ayrı millətlərə vətənimizdə yer vermişik ki, yaşasınlar, onu parçalamağa çalışan hər bir nəfər erməni xislətli, düşmən niyyətlidir. Düşmən niyyətlilərə vətənimizdə yer yoxdur.

Gəlin ulu öndərimizin tarixi kəlamına əməl edib azərbaycanlı olmağımızla fəxr edək.

## Ədəbiyyat

1. Kalankatuklu, M. (1993). AIbaniya tarixi, Bakı, Elm.
2. “AMB”. (2007). Elmi Mərkəzi, Bakı.
3. Bünyadov, Z. (1989). Azərbaycan VII-XIX əsrlərdə, Bakı.
4. Əliyev, Ə. (2009). Laçın qədim Oğuz yurdu, Bakı.
5. Məmmədov, X., Məmmədov, N. (2008). Erməni iddiaları və azərbaycanlıların soyqırımı, Bakı.
6. Şükürov, S. (1999). Gəncə.
7. Seyidov, M. (1989). Azəbaycan xalqının soykökünü düşünərkən, Bakı, Yazıçı.
8. https://copat.gov.az/docs/Nesrler/AZE/Erm%C9%99ni%20uydurmalar%C4%B1/Ermenicilik_uydurmalari.PDF?_t=1563357652
9. http://newtimes.az/processestrends/5669/

Göndərildi: 16.03.2019 Qəbul edildi: 30.07.2019

DOI: https://doi.org/10.36719/2706-6185/01/19-22

**Алмас Джалил кызы Мурадова**
Институт истории им. А.А.Бакиханова НАН АР
кандидат исторических наук
almas.muradova@gmail.com

# ФОРМЫ И МЕТОДЫ РАБОТЫ СРЕДИ ЖЕНЩИН АЗЕРБАЙДЖАНА В 20-30-ые ГОДЫ XX ВЕКА

**Резюме**

В 20-30-х годах 20 века партии и государственные учреждения использовали различные методы для решения женских проблем. Женские отряды по всей стране, основанные в ноябре 1920 года, играли активную роль в продвижении свободы женщин и нового образа жизни. Были проведены собрания представительниц женского пола, созданы специальные женские школы, курсы, кружки, ремесла и мастерские.

В этой статье возрастающая активность женщин интерпретируется как результат этой деятельности.

***Ключевые слова:*** *женотделы, работницы, крестьянки,советское строительство, женская проблема*

**Almas Jalil Muradova**
ANAS Institute of History named after A. Bakikhanov
Ph.D in history
almas.muradova@gmail.com

## Working methods among the Azerbaijani women in the 20-30s of the 20th century

**Abstract**

In the 20-30s of the 20th century, parties and state institutions used various methods to solve women's problems. Founded in November 1920, women's units throughout the country have played an active role in promoting women's freedom and new lifestyles. They held a meeting of women representatives, established special women's schools, courses, clubs, artes and workshops.

In this article, the increasing activities of women are interpreted as a result of these activities.

***Keywords:*** *women departments, women workers, peasant women, Soviet construction, women's issue*

## Введение

В решении женской проблемы в Азербайджане исключительную роль сыграли женотделы, которые начали создаваться повсеместно в республике с ноября 1920 г. Эта была новая, невиданная ранее, форма работы среди женщин. Такие отделы имелись при ЦК, Бакинском комитете и уездных комитетах партии. Женотделы принимали самое деятельное участие в раскрепощении женщин и приобщении их к строительству новой жизни. Они созывали женские делегатские собрания, которые были основной формой массовой работы партийных организаций среди женщин в эти годы (Коммунист, 1982), организовывали курсы по ликвидации неграмотности, специальные женские школы, клубы, профессиональные артели и мастерские (Гулиев, 1970: 613).

Структура женотделов в разных регионах страны была различной, она строилась в соответствии с особенностями того или иного региона. Женотдел ЦК РКП(б) состоял из трёх подотделов: организационно-шютрукгорского, агитационно-пропагандистского и подотдела печати. Кроме трёх подотделов был ещё сектор по работе среди женщин Востока (Чирков, 1978).

В Азербайджане помимо организационно-инструкторского подотдела и подотдела пропаганды и агитации был ещё советский подотдел. В отчёте женотдела ЦК партии за 1922 г. отмечалось: «Опыт показал необходимость этого подотдела. При его помощи установлена

связь с наркоматами, разработаны положения об их взаимоотношениях с Центральными организациями местных советских отделов с женотделами. Установлена связь с совнархозом, который дал нужные указания своим местным органам по вопросам, связанным с организацией мастерских и артелей (Государственный архив политических партий и общественного движения Азербайджанской Республики, 260).

Центральный женотдел рассылал нижестоящим комитетам и женотделам циркуляры и письма об очередных задачах, формах и методах работы среди женщин, требовал отчёты, проверял их работу. Регулярно созывались совещания заведующих женотделами губернских комитетов, на которых руководители женотделов обменивались опытом и разрабатывали план дальнейшей работы. Инструкторы женотдела постоянно выезжали на места для того, чтобы помочь наладить работу среди женщин, выступить на женских конференциях или собраниях.

Особенно большая помощь требовалась низовым организациям на Востоке. Краевое совещание завженотделами Закавказья в 1921 г. одобрило опыт Центрального женотдела Азербайджана, который «выработал такое положение, что выезжая на место, инструктор должен проработать месяца два-три, чтобы он действительно мог там направить работу и помог работать тому отделу, где он находится...» (Чирков, 57).

Учитывая местные условия: особенности быта и традиции мусульман, женотделы очень осторожно проводили свою работу на местах. В результате деятельности этих отделов женщины постоянно вовлекались в общественную работу. Женотделы быстро завоевали популярность и доверие женских масс, превратились в подлинные боевые штабы передовых женщин-мусульманок. В январе в 1921 г. в Баку было созвано первое совещание заведующих женотделами (Гулиев, 1972), которое признало их важную роль. Достаточно сказать, что ровно за год со дня их организации вокруг них обьединялось 20 тысяч женщин, подготовлено 75 женских работников (Гулиев, 1972: 380).

Отмечая историческую роль женотделов в Азербайджане, активная деятельница женского движения, зав. женотделом ЦК АКП (Государственный архив политических партий и общественного движения Азербайджанской Республики, 260) Виктория Цейтлин говорила: «Наши бакинские методы работы среди женщин явились примером для всего Закавказья и легли в основу работы Международного Женского Секретариата при Коминтерне...»(Султанова, 1964: 32).

Большую работу среди женщин-азербайджанок и вовлечению их в новую жизнь сыграл первый беспартийный съезд женщин Азербайджана, состоявшийся в феврале 1921 г. в. Баку. Впервые в истории женщины собрались на свой съезд, на который прибыло 1188 делегатов. Из них 815 из Баку, 369 из 12 уездов республики, 4 делегата из Дагестана (Бакинский рабочий, 1921). Национальный состав делегатов был следующим: азербайджанки 41,8, русские 36,7, армянки 13,8, представители других наций 7,7% (История Азербайджана, 221).

Основной целью созыва съезда было повышение активности трудящихся женщин Азербайджана и организация работы женотделов в уездах. На съезде были обсуждены следующие вопросы: «Женщина и Советская власть», «О просвещении», «О съезде женщин Востока» и др. (Бакинский рабочий, 1921) приветствуя делегаток, Нариман Нариманов подчеркнул: «Небывалое собрание, неслыханная весть, что происходит перед нашими глазами, т.е. настоящий съезд... созван для того, чтобы Вы здесь сказали все горе и все нужды, все ваши чаяния, мечты и революционное правительство примет все вышесказанное во внимание, исполнит все ваши желания» (ГАППОДАР, 260). Делегаты принимали активное участие в работе съезда. Среди многочисленных записок одна особенно характерна: «Мы, женщины-мусульманки, надеемся, что съезд запретит, чтобы нас выдавали замуж в 9-12 лет, когда мы только начинаем цвести, в угнетенье нашим мужьям» (Бакинский рабочий, 1921).

В своих выступлениях делегаты говорили о тех болъших преимуществах, которые дала им Советская власть. Все решения, принятые на съезде, были направлены на улучшение положения женщин. Съезд избрал 150 делегатов на съезд женщин Востока (Султанова, 1966: 14).

Съезд обратился с воззванием к женщинам всего Востока, с призывом последовать примеру трудящихся женщин Азербайджана (Султанова, 1974: 19-20). Важнейшим результатом первого

беспартийного съезда женщин Азербайджана явилось вовлечение трудящихся женщин в дело государственного управления.

Одной из форм связи женотделов с женщинами были делегатские собрания, которые впервые были созданы в 1919 г. в Москве, а затем и в других республиках, и просуществовали до 1933 г. (Чирков, 89). Женотделы сосредоточили главное внимание на работе с представителями отсталых слоёв трудящихся женщин, которых называли делегатками. А через делегаток женотделы оказывали влияние на остальных женщин.

Делегатки избирались работницами и крестьянками на годичный срок. Они объединялись в группы, которые называли делегатскими собраниями. В составе делегатских собраний они проходили определенную теоретическую подготовку и получали навыки практической работы в государственных учреждениях и общественных организациях. Совещание при ЦК РКП (б) заведующих губернскими женотделами в 1921 г. так определило задачи делегатских собраний: «Объединить вокруг партии, Советов и профсоюзов отсталые слои работниц и крестьянок, втянуть их в круг общественных, производственных, профессиональных и партийных интересов, научить вести определенную практическую работу по советскому, партийному и профессиональному строительству и сделать работницу и крестьянку активными членами партии и работниками во всех общественных и государственных учреждениях». Это были первые практические шаги на пути приобщения и вовлечения женщин к государственному строительству.

В городах делегатские собрания создавались на крупных предприятии, имеющих 300 и более работниц, или даже в отдельных цехах.

Работа делегатских собраний тесно увязывалась с работой всех общественнополитических организаций, как в городе, так и в деревне. В 1922 г. в Азербайджане делегаток было 1346, в 1923 г. это количество уже удваивается. Делегатки 1923 г. по социальному составу определялись следующим образом: 700 работниц, 458 крестьянок, 102 домохозяйки и 318 служащих (Султанова, 38). В 1925 г. по всему Азербайджану было избрано более 2826 делегаток, для которых создавались специальные кружки по вопросам советского, хозяйственного и культурного строительства (ГАППОДАР, 236-211). В 1927 г. в делегатских собраниях уже числилось 7116 женщин из них 3225 (45,2 процентов) составляли женщины-крестьянки (Статистический материал VIII съезду АКП, 1927: 61). В январе 1927 г. состоялось общебакинское женское делегатское собрание, на котором участвовало свыше тысячи женщин-делегаток г. Баку и его пригородов. В резолюции, принятой собранием, была подчеркнута необходимость широкого вовлечения женщин в советскую работу (Бакинский рабочий, 1927).

Делегатки вовлекались в политическую работу, прикреплялись к детским учреждениям, школам, кооперативам, ЗАГСам, Нарсудам и т.д. Из актива делегаток выдвигались женщины-азербайджанки на работу в Советах, кооперации и профсоюзные органы. К концу 1927 г. в Азербайджане 14,846 женщин являлись членами профсоюзов, 2504-членами Советов, 3349 учились в вузах и техникумах. Многие из них были выдвинуты на руководящую советскую, хозяйственную и профсоюзную работу. Так, например, в 1927 г., председателями сельсоветов были выдвинуты 9 женщин, в состав АзЦИКа вошли 11 женщин, в дайраиспокомы -11. А в 1928 г. 119 женщин были избраны председателями сельсовета, 160-членами дайраисполкомов, 36-членами уездных исполкомов, 17-членами ЦИК СССР, ЗСФСР и Азерб. ССР (Шихпинский, 1967: 42). Они проводили большую и полезную работу.

Немаловажную роль в приобщении женщины к государственной работе сыграл VI съезд Советов Азербайджана, состоявшийся в апреле 1929 г. Съезд принял обращение «Ко всем рабочим, крестьянам и трудящимся Азербайджана»,в котором отмечалосъ: «Шестой съезд Советов обращается ко всему трудящемуся народу Азербайджана с призывом оказать всяческое содействие делу окончательного раскрепощения азербайджанки. Особое внимание всех общественных и советских организаций, всей советской общественности должно быть обращено на усиление культурной работы, в частности, на ликвидацию неграмотности среди тюрчанок, на вовлечение женщин в производство, на расширение сети женских клубов, уголков крестьянок, изб-читален, на привлечение ее к активной работе в кооперации, в Советах для

поднятия культурно-политического уровня основных масс тюркской женщины...» (Резолюции и постановления съездов Советов Азербайджаъюкой ССР, 1961: 91-114).

Закрывая съезд С.А.Агамалиоглы отмечал: «Обращение съезда по вопросу о раскрепощении женщины имеет колоссальное значение. Надо добиться, чтобы ни одна батрачка, ни одна работница и крестьянка не оставались под чадрой. Я думаю, что ваша энергия претворит в жизнь все, что мы здесь приняли» (ГААР, 379).

## Результат

Таким образом, в 20-30-ые годы республиканскими органами власти были предприняты меры по широкому вовлечению женщин в общественно-полштическую жизнь, важную роль в котором сыграли женотделы. Женотделы принимали участие в раскрепощении женщин и приобщении их к строительству новой жизни. Они созывали женские делегатские собрания, которые были основной формой массовой работы партийных организаций среди женщин в указанные годы, организовывали курсы о ликвидации неграмотности, специальные женские школы, клубы. профессиональные артели и мастерские.

## Литература

1. Коммунист, 1982, 26 мая.
2. Гулиев, Дж. (1970). Борьба Коммунистической партии за осуществление ленинской национальной политики в Азербайджане. Баку. с. 613.
3. Чирков, П. (1978). Решение женского вопроса в СССР (1917-1937 гг.). М., 54 с.
4. Государственный архив политических партий и общественного движения Азербайджанской Республики (ГАППОДАР), ф. 1, оп. 260, д. 2, л. 2.
5. Чирков, П. Указ. раб., с. 57.
6. Гулиев, Дж. (1972). Под знаменем ленинской национальной политики. Осуществление Коммунистической партии ленинской национальной политики в Азербайджане в 1920-1925 гг. Баку, с. 380.
7. Султанова А. (1964). Счастливые женщины Советского Азербайджана. Баку. с. 32.
8. Бакинский рабочий, 1921, 11 февраля.
9. История Азербайджана. 6 с., s. 221.
10. Бакинский рабочий, 1921, 11 февраля.
11. ГАППОДАР, ф. 1, оп. 260, д. 51.
12. Бакинский рабочий, 1921, 13 февраля.
13. Султанова, А. (1974). Счастье женщин Азербайджана. Баку, с. 19-20.
14. Чирков, П. Указ. раб., с. 89.
15. Резолюции II съезда АКП(б). Баку, 1920, с. 6-7.
16. Султанова, А. (1966). Из истории женского движения в Азербайджане (1920-1941 гг.). Автореф. канд. дис. Баку, с. 14.
17. ГАППОДАР, ф. 1, оп. 260, д. 32, л. 5
18. Султанова, А. Указ. раб., с. 38
19. ГАППОДАР, ф. 1, оп. 236, д. 211, л. 2
20. Статистический материал VIII съезду АКП(6). Баку, 1927, с. 61.
21. Бакинский рабочий, 1927, 5 января.
22. Шихпинский, З. (1967). Советское строительство в азербайджанской деревне (1926-1937 гг.). Автореф. докт. ист. наук. Баку, с. 42.
23. Резолюции и постановления съездов Советов Азербайджаъюкой ССР (1921-1937 гг.) Баку, 1961, с. 91-114.
24. ГААР, ф. 379, оп. 16, д. 75, л. 15.

Сообщение от: 10.05.2019 Отправлено: 23.07.2019

QƏDİM DİYAR Beynəlxalq onlayn elmi jurnal. 2019 / № 01/01 / 23-28 ISSN: 2706-6185
ANCIENT LAND International online scientific journal. 2019 / № 01/01 / 23-28 e-ISSN: 2709-4197

DOI: https://doi.org/10.36719/2706-6185/01/23-28

**Elşad Nurəliyev**
AMEA A.Bakıxanov adına Tarix İnstitutu
elshad.nuraliyev@mail.ru

# XUDADAT BƏY AĞA OĞLU MƏLİK-ASLANOV

**Xülasə**

Xudadat bəy Ağa Aslanov xalqımızın müstəqilliyində, tərəqqisində və şərqdə ilk demokratik respublikanın qurulmasında müstəsna xidmətləri olan şəxslərdəndir. O, AXC-də rabitə və teleqraf naziri vəzifəsində çalışıb. AXC yarananda bu sahədə çoxlu problemlər var idi. Lakin Xudadat bəy Ağa Aslanovun fəaliyyəti nəticəsində bu sahədə xeyli irəliləyiş əldə edilmişdir. Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra Xudadat bəy Məlik-Aslanovun fəaliyyətinin ikinci mərhələsi başlayır.

***Açar sözlər**: Azərbaycan Demokratik Respublikası, Xudadat bəy Ağa oğlu Məlik-Aslanov, Poçt və Teleqraf Nazirliyi*

**Elshad Nuraliyev**
ANAS Institute of History named after A.Bakikhanov
elshad.nuraliyev@mail.ru

# Khudadat bey Agha oghlu Malik-Aslanov

**Abstract**

Khudadat bey Agha Aslanov is one of the persons who have rendered exceptional services to the independence, progress and prosperity of our people, in the establishment of the first democratic republic in the East. He served as Minister of Communications and Telegraph at ADR. When ADR was established, there were many problems in this area. However, as a result of the activities of Khudadat bey Agha Aslanov, there has been considerable progress in this area. After the establishment of Soviet power in Azerbaijan, the second phase of Khudadat bey Melik-Aslanov's activity began.

***Keywords:** Democratic Republic of Azerbaijan, Khudadat bey Aga oghlu Malik-Aslanov, Ministry of Post and Telegraph*

## Giriş

Xalqımızın istiqlala qovuşmasında, tərəqqisində, Şərqdə ilk demokratik respublika – Azərbaycan Demokratik Respublikasının, Xalq Cümhuriyyətinin qurulmasında müstəsna xidmətlər göstərmiş şəxsiyyətlərdən biri də Xudadat bəy Ağa oğlu Aslanovdur.

Xudadat bəy Məlik-Aslanov məşhur alim, ixtiraçı-mühəndis idi. O, 1879-cu ilin aprelində Şuşa şəhərində anadan olub. 1899-cu ildə Şuşa realni məktəbini bitirmişdir. Şuşada təhsilini başa vurduqdan sonra Peterburq Yol Mühəndisliyi İnstitutuna daxil olan X.B.Məlik-Aslanov 1904-cü ildə ali təhsilini birinci dərəcəli diplomla bitirmişdir. İnstitut həyatından sonra bir müddət siyasi fəaliyyətlə məşğul olmuşdur. 1901-1904-cü illərdə Rusiya Sosial-Demokrat Fəhlə Partiyasının üzvü olmuş və partiyanın Peterburq komitəsində çalışmışdır. Lakin sonradan RSDFP-nin sıralarını tərk edən Xudadat bəy Məlik-Aslanov heç bir partiyaya mənsub olmamış və ömrünün sonuna qədər bitərəf qalmışdır. Siyasi fəaliyyətini bitirdikdən sonra o, sırf ixtisası üzrə çalışmış və bir sıra mühüm layihələrin həyata keçirilməsində yaxından iştirak etmişdir. Xudadat bəy Məlik-Aslanovun ilk işi isə Peterburqda Petrozavodsk dəmiryolunun çəkilişi olmuşdur. Dəmiryolunun çəkilişində Xudadat bəy Məlik-Aslanov təqribən 6 aya yaxın işləmişdir. O, 1905-ci ilin əvvəllində müəyyən səbəblərə görə Peterburqdan Tiflisə köçmüş və Zaqafqaziya dəmiryolu idarəsində işləməyə başlamışdır.

Əvvəlcə stansiya rəisinin köməkçisi, sonra Zaqafqaziya dəmir yolunun ən ağır və dağlıq hissəsi hesab edilən Suram aşırımı keçidində yol xidməti rəisinin köməkçisi, daha sonra isə rəisi təyin olunmuşdur. Onun rəhbərliyi ilə bu sahədə xeyli tikinti işləri aparılmış, ikinci yolun çəkilişi davam etdirilmiş, Çiatura marqans mədəninə ensiz dəmir yolu çəkilmiş və s. texniki işlər görülmüşdür. İstehsalat fəaliyyəti ilə məşğul olmaqla yanaşı Xudadat bəy Məlik-Aslanov elmi fəaliyyətdən də qalmamış, bir sıra elmi məqalələr yazmışdır.

Peterburqda və Tiflisdə işlədiyi qısa dövr ərzində jurnallarda onun dörd elmi məqaləsi dərc edilmişdir. Bundan əlavə, onun dəmir yolu sahəsində xeyli ixtiraları da olmuşdur. İstedadlı mühəndisin dəmir yolu texnikası sahəsində etdiyi yeni ixtiralar onu bütün dünyada məşhurlaşdırmışdır.

Məlum olduğu kimi, 1917-ci ilin fevralında Rusiyada burjua inqilabı baş verdi. Həmin ilin mart ayının 9-da isə yeni qurulan müvəqqəti hökumətin göstərişi ilə Xudadat bəy Məlik-Aslanov Tiflisə köçürülmüş və Zaqafqaziya dəmir yolu üzrə müvəkkil təyin edilmişdir. O, 1917-ci il noyabrın 15-də Zaqafqaziya Komissarlığında Dəmir yolu Nəqliyyatı Nazirliyi üzrə komissar və 1918-ci il aprelin 26-da yaranmış müstəqil Zaqafqaziya Federativ Respublikası hökumətində dəmir yolu (nəqliyyatı) naziri olub. Nazir olduğu müddətdə Xudadat bəy Məlik-Aslanovun dəmir yolu nəqliyyatı tarixindən bəhs edən, rus dilində kitabı çap olunmuşdur. Məlum hadisələrlə əlaqədar olaraq 1918-ci ilin mayın 28-də Zaqafqaziya Federativ Demokratik Respublikası dağıldı və ADR öz suverənliyini elan etdi. Bitərəf Fətəlixan Xoyskinin təşkil etdiyi birinci ADR hökumətində Xudadat bəy Məlik-Aslanov dəmir yolu nəqliyyatı və poçt-teleqraf naziri təyin olunmuşdur. (Azərbaycan Demokratik Respublikası, 1990: 72). O dövrdə yüksək ixtisaslı illik kadrların çatışmaması problemini həll etmək üçün peşə məktəbləri, ixtisasartırma kursları və digər dərnəklər təşkil edilirdi. Dəmir yolu nəqliyyatı sahəsi Azərbaycan üçün yeni olduğuna görə bu sahədə çalışa biləcək yüksək ixtisaslı kadrlar, demək olar ki, yox dərəcəsində idi. Bu problemin həll edilməsində və peşəkar kadrların hazırlanmasında Xudadat bəy Məlik-Aslanovun böyük əməyi olmuşdur. Məhz onun təşəbbüsü ilə 1919-cu ildə Bakıda ana dilində dərs keçilən ilk dəmir yolu nəqliyyatı məktəbi açılmışdır. Onun gərgin əməyi sayəsində Azərbaycan dəmir yolunda böyük təmir işləri aparılmış və nəqliyyatın nizamlı surətdə işləməsi qaydaya salınmışdır.

Cümhuriyyət dövrünün ilk günlərində rabitə sahəsində də vəziyyət olduqca acınacaqlı idi.

Real mənzərəni hökumət başçısı Fətəli Xan Xoyski Azərbaycan Parlamentinin açılışındakı çıxışında göstərmişdi: "Bir vaxt idi ki bir kənddən o biri kəndə getmək qorxulu idi, gecə yatanda sabaha çıxmaq ümidi yox idi. Dəmir yollarında rus qoşunları qayıdarkən nə hallar oldu. Başımıza nə fəlakətlər gəldi, dəmir yolları tamamilə yatmışdı. Poçt, teleqraf yox idi. Bir kağız yollamaq mümkün deyildi”.

Hətta istiqlaliyyətin elanı haqqında teleqramların göndərilməsi Tiflisdə olarkən Azərbaycan hökuməti üçün müşkülə çevrilmişdir. Tiflisdən Gəncəyə köçdükdən sonra da poçt və teleqraf əlaqələri gənc Azərbaycan dövləti üçün ciddi problem olaraq qalırdı. Hökumətin gördüyü ilk tədbirlərdən biri Azərbaycan Respublikası hüdudlarında poçt və teleqraf köçürmələrinin ödənilməsi üçün Gəncənin poçt-teleqraf idarəsinə yerli xəzinədarlıq hesabına 100 mln rubl məbləğində vəsait ayrılması haqqında qərar verilməsi olmuşdur.

Hökumət ilk növbədə Tiflislə rabitə yaratmaq üçün tədbirlər görməyə başladı. Gənc Azərbaycan dövləti üçün taleyüklü məsələlərin həll olunduğu bir zamanda, xüsusən yardım gözləyəcəyi beynəlxalq aləmlə, dost qonşu dövlət kimi Türkiyə ilə intensiv əlaqələrin təminatı tələb olunduğu halda İstanbuldakı Azərbaycan nümayəndə heyəti ilə yazışmalar nəinki vaxtında, əsasən ünvana çatmırdı. Cümhuriyyətin yaranmasından 3 ay keçməsinə baxmayaraq, vaxtaşırı və dürüst məlumat əldə etmək üçün hökumətin Batumidə bir nəfər məmur saxlaması zərurətə çevrilmişdi. Bakını işğalçılardan azad etdikdən sonra hökumətin Gəncədən buraya köçməsi ilə rabitə işi sahəsində fəaliyyət göstərmiş, poçt teleqraf idarələrinin işi bərpa edildi. Xüsusən də hökumət üzvləri arasında nazirliklərin oktyabrında yenidən müəyyənləşdirilməsi zamanı poçt və teleqraf nazirliyinin müstəqil fəaliyyətinin təmin edilməsi rabitə sahəsində işlərin nizama salınması, poçt və teleqraf əməliyyatlarının həyata keçirilməsini sürətləndirdi (Əliyarlı, 2009, 65-75).

Azərbaycan Xalq Cümhuriyyətinin parlamenti və hökuməti rabitə işinin səviyyəsini qaldırmaq və inkişaf etdirmək məqsədilə bir sıra qanun və qərarlar qəbul etdi. Poçt və Teleqraf Nazirliyinə sərbəst səlahiyyət imkanları yaradıldı. Nazirlik üçün zəruri olan malların əldə olunması məqsədilə neft məhsullarının mübadiləsi haqqında qərar verildi. Nazirlik üzrə poçt və teleqraf məktəbi şagirdlərinin orduya çağırışdan azad edilməsi qərara alındı. Fransaya səfərə getmiş Azərbaycan hökümətinin nümayəndə heyətinin başçısı Əlimərdan bəy Topçubaşov 1919-cu ilin noyabrında Eyfel qülləsindəki radiostansiyadan Gəncə radiostansiyasına, Cümhuriyyətin hökümət başçısına teleqram göndərmişdi. Teleqramda deyilirdi ki, "Əziz vətənimizin iqtisadi və mədəni tərəqqisində böyük rol oynayacaq ilk Azərbaycan radiostansiyasının fəaliyyətə başlaması münasibət ilə Sizi təbrik edirəm!"

Səfər zamanı Azərbaycan ilə Fransa arasında poçt-teleqraf sahəsində saziş imzalamışdır. Əlimərdan bəy Topçubaşov İsveçrədə, Bern şəhərində yerləşən Ümumdünya Poçt İttifaqına üzv olmaq üçün Beynəlxalq Büroya ərizə ilə müraciət etmişdi.

Poçt və teleqraf nazirliyi nəzdində fəaliyyət göstərən radiostansiyaların vəziyyəti Azərbaycan Parlamentində müzakirə olunmuşdur. Bakı sahil radiostansiyasının ştatı haqqında qanun layihəsinin müzakirəsi zamanı bildirilmişdir ki, Bakıdakı radiostansiyası "simsiz teleqraf" üç aparatdan ibarətdir və bu aparatlar Avropanın üç böyük stansiyalarından eyni vaxtda daxil olan xəbərləri qəbul edə bilmir. Radiostansiyanın işinin gücləndirilməsi yönündə konkret təkliflərdən sonra 3-cü oxunuşda 1920-ci il fevralın 26-da qanun qəbul edilmişdir. Azərbaycan Xalq Cümhuriyyətinin Dövlət gerbi və möhürü layihələrinin tərtibi müsabiqəsi də poçt və teleqraf nazirliyinin fəaliyyəti ilə bağlı olmuşdur.

Nazirliyin həyata keçirdiyi mühüm tədbirlərdən biri də Azərbaycan hökumətinin poçt markalarının hazırlanaraq tədavülə buraxılması olmuşdur. Cümhuriyyət hökumətinin poçt və teleqraf nazirliyinin fəaliyyəti haqqında "Azərbaycan Xalq Cümhuriyyəti" ensiklopediyasında konkret məlumatlar verilir. Cümhuriyyət dövründə rabitə sahəsində əldə edilən uğurlar, sahənin inkişafı müvafiq nazir postunda çalışmış şəxsiyyətlərin adı ilə bağlıdır. Azərbaycanda rabitə işinin inkişafında şübhəsiz ki, nazir olaraq Xudadat bəy Məlik Aslanovun da əvəzsiz xidmətləri olmuşdur. Azərbaycanın inkişaf tarixində silinməz izlər buraxmış böyük şəxsiyyətlərdən biri kimi X.Məlik-Aslanovu həyat və fəaliyyətinin, rabitənin inkişafında xidmətlərinin öyrənilməsinə və geniş oxucu kütləsinə çatdırılmasına böyük zərurət vardır "Azərbaycan Xalq Cümhuriyyətinin Ensiklopediyası, 2005: 3).

X.Məlik-Aslanovun Parlamentdəki fəaliyyəti müasir idarəçilik baxımından ibrətamiz səciyyə daşıyır. Xudadat bəy Məlik-Aslanovun hökumətə təqdim etdiyi qanun layihəsinə görə Azərbaycan yollarının hamısı xəzinə xərci ilə təmir ediləcəkdi. Dəmiryol qulluqçuları haqqında qanun layihəsinin müzakirəsi zamanı Xudadat bəy Məlik-Aslanovun çıxışı Azərbaycan dəmiryollarının real vəziyyəti haqqında ətraflı hesabat məlumatı xarakteri daşımışdır. 1919-cu ilin fevralına qədərki vəziyyəti həmin vaxtdakı durumla müqayisə edərək konkret rəqəmlər əsasında əldə olunan nəticələri təhlil etmiş və təkliflər vermişdir. Parlament iclaslarında fəal iştirak edən Məlik-Aslanovun bir nazir kimi çıxışla sırf professional məzmuna malik, siyasi konyukturadan uzaq praktiki-nəzəri mahiyyət daşımışdır.

"Bizim məmləkətimizi bəyan edən də hətta bizə bir çox düşmən qazandıran bir sərvətimiz var: Neft ildə 500 milyon hasil olur. Əvvəlləri bu miqdarın bir hissəsi Batuma, yerdə qalanı Rusiyaya göndərilirdi. Batuma dəmir yolu il 1917-ci ildə 40 milyon pud, digər illərdə hər il 50-60 milyon pud neft istehsal olunmuşdur. İndi Batuma o qədər neft göndərmək mümkün deyildir, çünki, dəmir yolu ancaq 20 milyon pud neft apara bilir, əlavə neft provodu ilə də 50 milyon pud göndərilir Bir tərəfdən neft lazımi qədər getmir, o biri tərəfdən sərbəst satış elan edilsə də, çıxarılan neftin əvəzinə mal gəlmir... Neft məsələsinə məhəlli deyil, cahan nöqteyi-nəzərindən baxmaq lazımdı" (Azərbaycan Xalq Cümhuriyyəti (1918-1920), 1998: 216).

Dəmiryol tariflərinin artırılması haqqında qanun layihəsinin müzakirəsində Məlik-Aslanov xüsusi fəallıq göstərmişdir. Dəmir yollarının gündəlik 70-80 min manat zərər çəkdiyini əsaslandıraraq təxirəsalmadan layihənin qəbul edilməsinə çalışmışdır.Dövlətçilik prinsipini üstün tutan Xudaddat bəy konstruktiv təkliflərlə çıxış etmiş və fəaliyyətini də bu istiqamətdə qurmuşdur.

Yalnız rəhbərlik etdiyi nazirliyin ixtiyarında olan yolların deyil, bütün yolların təmirini vacib saymışdır:

“Zemstvo idarələri təsis edilənədək gözləmək olmaz. Yolların təmiri elə bir mühüm məsələdir ki, təxirə salmaq mümkün deyildir. Yolların təmiri üçün camaatı işlətmək məsələsinə gəlincə, hökumət bu işi demokratik hesab etmədiyindən qərar vermişdir ki, camaatı pulsuz işlətməyərək, yolların təmiri və sair xidmətlərə dövlət xəzinəsindən muzd verilsin.

Nazirin parlamentdəki çıxışlarından, onun təşəbbüskar, cəsarətli, qətiyyətli və müşkül problemlərdən qaçmayaraq sərrast, təmkinli mülahizə yürütməsi güvənli peşəkarlıq biliyindən və təcrübəsindən irəli gəlirdi. Bakı-Culfa dəmir yolunun təmirinin davam etdirilməsi haqqında qanun layihəsinin müzakirəsi zamanı onun dediyi aşağıdakı sözlər bu baxımdan maraqlıdır:

— “Burada müşkülat olacaqdır. Amma bununla bərabər ümidvarıq ki, işi aparaq, başa gəlsin və ləngə düşməsin".

Xudadat bəy bir nazir kimi öz fəaliyyəti barəsində məlumat verməkdən nəinki yayınmamış, əksinə buna meyilli olmuş, digər nazirlərlə müqayisədə işi daha səriştəli səviyyədə həyata keçirmişdir. Onun parlamentdəki çıxışları bilavasitə məşğul olduğu sahəyə aidiyyatı ilə diqqəti cəlb edir. Bu məsələlərə dair hökumət üzvü kimi açıqlıq gətirməsi məcburi xarakter daşımamışdır. Əksinə hər fürsətdə, ən başlıcası isə əlaqəli şəkildə rəhbərlik etdiyi nazirliyin işində irəliləyişləri qeyd etməklə, mövcud problemlərdən və onların həlli yollarından bəhs etmişdir. Ümumi sözçülükdən tamam uzaq olan nazir, ona ünvanlanmış tənqidi qeydləri yalnız məntiqi və əks arqumentli dəlillərlə cavablandırmamış, faktlar və nümunələr əsasında şərh vermişdir. Heç bir halda onun çıxışlarında mahiyyətdən kənar qeyri-etik fikirlərə rast gəlmək olmur. Opponentlərə onların iradlarının məğzini şərtləndirən cəhətlərə diqqət çəkməklə cavab verirdi. Qeyd etmək lazımdır ki, Xudadat bəyin çıxışlarından sonra diskussiya qızışmır, əksinə məsələnin müzakirəsi başa çatır və əksər hallarda qanun layihəsinin qəbulu ilə nəticələnir" Onun işgüzar xüsusiyyətləri hamıya aydınca bəlli olur. Nazirin əsaslandırılmış ətraflı məlumatı qaneedici olduğundan və çıxışlarında, həm də fəaliyyətində heç bir siyasi oriyentasiya gözlənilmədiyindən, mümkün qədər yoxsul təbəqənin mənafeyini nəzərə almağa səy göstərdiyindən ona qarşı adekvat münasibətin etimada söykəndiyi bütün hökumət tərkiblərində nazir postuna rəhbərlikdə bir daha təsdiqini tapır. Xudadat bəy Cümhuriyyət hökumətinin nəinki dəyişilməz üzvü olaraq fəaliyyət göstərmiş, həm də peşəkarı olduğu yollar nazirliyinə rəhbərliklə yanaşı hökumət tərkiblərində poçt və teleqraf, ticarət, sənaye və ərzaq üzrə nazir vəzifələrini icra etmək də ona həvalə olunmuşdu (Azərbaycan Demokrtatik Respublikası, 1990: 91).

1919-cu ilin oktyabrında X.Məlik-Aslanov çıxışında deyirdi:

“Təriq və məabir nəzarətində” artıq bir şey və xidmətçi yoxdur. Hər adam öz lazımı yerindədir. Dəmir yolunun işi bir də nefteprovoddur. Bu barədə (mirovoy rekord) vurmuşuq. Neft trubalarını təmizləyib az vaxta (kerosin provod) Cöhər trubaları etməkdə ingilislər də təəccüb ediblər. Heç Amerikanın özündə də böylə şey görünməyibdir".

Cümhuriyyət hakimiyyətinin böhranlı vəziyyəti Xudadat bəyin çıxışlarından da bəlli olur:

«Vəziyyətimiz gündən-günə ağırlaşır, ticarət azalır» Batumdan yol verməyirlər. Paraxod vermirlər, zaqraniçni banklar möhtəkirlik edirlər. Hökumət bu fəlakətdən qurtarmaq üçün çox şeylə imtahan edir".

Belə böhranlı vəziyyətdə Məlik-Aslanov radikal inzibatı tədbirlərin fayda verməyəcəyini göstərirdi:

— «Malı zəbt etməklə bahalığın qarşısını almaq olmaz. Bu bir qədər də bahalığa səbəb olar. Hökumət yalnız konkurensiya ilə bahalığın qabağına çıxır».

Cümhuriyyət hakimiyyətinin son ayında (1920-ci il, 8 aprel) dəmiryol tariflərinin artırılması haqqında qanun layihəsi müzakirə olunmuşdur. «Biz dəmir yolunu yoxdan vücuda gətirmiş olduq» fikrini vurğulayan Xudadat bəy məramını da açıqladı:

«Biz gərək öylə edək ki, bizim dəmir yolu Avropa qaydası ilə işləsin və oradakı məmurlar ilə demokratik qayda ilə rəftar edilsin». Bu niyyətini təmin edəcək vasitələri də yolları göstərən nazir, −”çox (az) adam var ki, təmiz dolanıb millət mənafeyini nəzərə alır. Hamı cib mənfəətini gözləyir”, − söyləməklə belələrinə qarşı nazirliyin mübarizə apardığını bildirdi.

− "Lakin eyni zamanda, − «Monopoliya isə başqa məsələdir». Monopoliya üçün bir qanun tərtib etmək lazımdır ki, onu da hökumətdən keçirib Parlamentə təqdim edilsin" deməyi də lazım bildi. Cümhuriyyət parlamentində müzakirə edilmiş qanun layihələrinin, qaldırılmış məsələlərin çağdaş Azərbaycan dövlətçiliyi üçün aktual əhəmiyyəti şəksizdir.

Öz sənətinin mahir bilicisi və peşəkarı olduğuna görə, F.Xoyskinin təşkil etdiyi ikinci və üçüncü hökumətlərdə də dəmir yolu naziri vəzifəsi ona həvalə olunmuşdur. Məlik-Aslanov 1918-ci ilin dekabrın 7-də Bakıda açılan Azərbaycan Parlamentinin üzvü seçilmişdir. Xudadat bəy Məlik-Aslanov Nəsib bəy Yusifbəylinin 1919-cu il martın 14-də təşkil etdiyi dördüncü hökumətin və həmin ilin dekabrın 12-də təşkil etdiyi beşinci hökumətin tərkibində də yollar naziri vəzifəsini daşımışdır (6).

Beşinci hökumətin tərkibində hətta o ticarət, sənaye və ərzaq naziri də olmuşdur. Yüksək təşkilatçılıq qabiliyyətinə görə, Xudadat bəy Məlik-Aslanov N.Yusifbəylinin müavini təyin edilmişdir. Bundan başqa, 1919-cu il iyunun 11-də yaradılmış Dövlət Müdafiə Komitəsi sədrinin birinci müavini olmuşdur. Xudadat bəy Məlik-Aslanovun Azərbaycan dilinin və latın əlifbasının təbliği sahəsində də böyük xidmətləri olub. Nazirlər Şurasının göstərişi ilə 1919-cu ilin aprelində latın əlifbasına keçmək üçün X.Məlik-Aslanovun rəhbərliyi ilə xüsusi komissiya yaradılmışdır. Həmin komissiyanın hazırladığı layihə Parlamentə təqdim edilmişdir. Lakin ADR–in süqutu səbəbindən qanun layihəsinin müzakirəsi yarımçıq qaldı.

Azərbaycanda Sovet hakimiyyətinin qurulmasından sonra Xudadat bəy Məlik-Aslanovun fəaliyyətinin ikinci dövrü başlanmışdır. Azərbaycanda sovet hakimiyyətinin qurulmasından sonra ölkədə aparılan quruculuq-abadlıq işlərində onun xidmətlərindən geniş istifadə edilmişdir. X.Məlik-Aslanov 1920-ci ilin əvvəllərində Azərbaycan Dövlət Tikinti Komitəsində əvvəlcə şöbə müdiri, sonra isə komitə sədri vəzifəsində işləmişdir. Bir müddət sonra isə o, Azərbaycan Ali Xalq Təsərrüfatı Şurası yanında dəmir yolu tikintisi idarəsinin rəisi və şuranın məsləhətçisi vəzifəsində çalışmışdır. Xudadat bəy Məlik-Aslanov 1923-1925-ci illərdə Azərbaycan Dövlət Plan Komitəsinin sənaye-nəqliyyat-tikinti bölməsinin üzvü, 1922-1924-cü illərdə Zaqafqaziya Dəmir Yolu idarəsinin üzvü, 1921-1930-cu illərdə Azərbaycan Politexnik İnstitutunun inşaat fakültəsində yol, sənaye, nəqliyyat və tikinti bölməsinin sədri, 1924-1930-cu illərdə həmin fakültənin dekanı, 1921-1930-cu illərdə RSFSR və Azərbaycanın bir sıra elmi-texniki və mədəni-maarif təşkilatlarının üzvü, 1927-1930-cu illərdə SSRİ Ali Xalq Təsərrüfatı Şurasının elmi-texniki kollegiyasının üzvü olmuşdur. Xudadat bəy Məlik-Aslanov 1926-1930-cu illərdə Azərbaycan Mərkəzi İcraiyyə Komitəsi üzvülüyünə namizəd də seçilmişdir. Bu dövrdə onun Moskvanın bir sıra jurnallarında bir neçə elmi məqaləsi dərc edilmişdir. 1927-ci ildə Azərbaycan Politexnik İnstitutunun nəşriyyatı, 1929-cu ildə isə Azərbaycan dövlət nəşriyyatı Xudadat bəy Məlik-Aslanovun dəmir yolu texnikasına aid iki kitabını nəşr etmişdir (7).

1930-cu illərin repressiyaları Məlik-Aslanovdan da yan keçməmişdir. ADR-in beş hökumətinin hər birində nazir vəzifəsini tutan Xudadat Bəy Məlik-Aslanov 1930-cu ilin əvvəlində Azərbaycan Baş Siyasi İdarəsi tərəfindən heç bir əsas olmadan həbs edilmişdir. Üç ildən çox həbsdə qaldıqdan sonra onu 1933-cu ilin ortalarında azad etdilər. Həmin ilin sentyabrından Azərbaycan Nəqliyyat İnstitutunda dəmir yolu kafedrasına və Azərbaycan İnşaat İnstitutunda inşaat işinin təşkili kafedrasına rəhbərlik etmişdir. Texniki elmləri sahəsində ilk azərbaycanlı professorlardan biri olmuşdur. Xudadat bəy Məlik-Aslanovun ADR dövründəki xidmətləri SSRİ rəhbərliyinin diqqətindən heç cür yayınmırdı. Ona görə də o, 1934-cü ilin avqustunda əsassız yerə yenidən həbs edilmiş və 1935-ci ilin iyulun 23-də vəfat etmişdir (8).

## Nəticə

M.Ə.Rəsulzadə «Əsrimizin Səyavuşu» əsərində Xalq Cümhuriyyəti haqqında belə bir maraqlı fikir də deyib:

- «Azərbaycan Cümhuriyyətinin əsas idarəsi bütün vətəndaşların bərabər hüquqlu yaşaması üzərində qurulmuşdu... Millət məclisi, məmləkətin bütün sinif və millətlərini təmsil edib, dövlətin tamamən taleyinə hakim idi. Onsuz heç bir məsrəf yapılmaz, heç bir müharibə başlanmaz, heç bir barışıq bağlanmazdı. Hökümət məclisin etimadını qazananda qalır, itirəndə düşürdü. Ortada hakim

olaraq vasitə-vəzifə də yox idi. Parlament hakimiyyəti mütləq idi. Burada Avropada tətbiq edilməyən həqiqi bir Xalq Cümhuriyyəti qurulmuşdu".

Xudadat bəy Məlik-Aslanov kimi vətənpərvər, həyatlarını xalqına, millətinə həsr etmiş insanlar tariximizin ən şərəfli səhifəsini yaratdılar, yazdılar. Onları isə nə tarix, nə də xalqımız unudan deyil!

## Ədəbiyyat

1. Azərbaycan Demokratik Respublikası. (1990). Azərbaycan hökuməti. 1918-1920, Bakı. s.72.
2. Əliyarlı, İ. (2009). Azərbaycan Xalq Cümhuriyyəti dövründə rabitənin inkişafı. "Mütərcim nəşriyyat", Bakı, səh. 65-75
3. Azərbaycan Xalq Cümhuriyyətinin Ensiklopediyası. (2005). İkinci cild. Bakı. s. 3.
4. Azərbaycan Xalq Cümhuriyyəti (1918-1920). (1998). Parlament (Snetoqrafik hesabatlar). İki cilddə. Birinci cild. Bakı, s.181, 216.
5. Azərbaycan Demokrtatik Respublikası. (1990). Azərbaycan hökuməti. 1918-1920. Bakı, s.91
6. http://anl.az/down/meqale/azerbaycan/2010/dekabr/146347.htm
7. https://525.az/news/169055-xalq-cumhuriyyetinin-deyisilmez-naziri-xudadat-bey-melikaslanov
8. https://news.milli.az/society/210553.html

Göndərildi: 14.05.2019 Qəbul edildi: 28.07.2019

# İÇİNDƏKİLƏR

**Şikar Məhəmmədəli oğlu Qasımov, Flora Qasımova**
Azərbaycan mədəniyyəti müstəqillik illərində ........................................................................ 4
**Məmməd Allahverdi oğlu Hüseynov**
İkinci dünya müharibəsi illərində azərbaycanlıların alman
faşistlərinə qarşı döyüşlərdə qəhrəmanlıqları ........................................................................ 8
**Əli Umud oğlu Əliyev**
Ermənilərin saxtalaşdırma siyasətinə tarixi baxış ........................................................................ 13
**Алмас Джалил кызы Мурадова**
Формы и методы работы среди женщин Азербайджана
в 20-30-ые годы xx века ........................................................................ 19
**Elşad Nurəliyev**
Xudadat bəy Ağa oğlu Məlik-Aslanov ........................................................................ 23

İmzalandı: 26.09.2019
Formatı: 60/84
H/n həcmi: 3
Sifariş: 167

https://aem.az saytında çap olunub.
Ünvan: Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: info@aem.az